# ƏXLAQ QAYDALARI

(Məsum imamların (ə) nəzərində)

Şeyx Hürr Amuli



Tərcümə edən: Məhəmməd Xəlilov

# Mündəricat

## ƏXLAQ QAYDALARI

### KİTAB HAQQINDA

Kitabın adı: Əxlaq qaydalari

Müəllif: Şeyx Hürr Amuli

Tərcümə edən: Məhəmməd Xəlilov

Naşir: Beynəlxalq əl-Müstəfa(s) Nəşr və Tərcümə Mərkəzi

Çap tarixi: ٢٠١١

Çap növbəsi: Birinci

Tiraj: ١٠٠٠

:ÌNVAN

İran, Qum, Şühəda meydanı, Höccətiyyə prospekti, Höccətiyyə mədrəsəsinin qarşısı, .Beynəlxalq əl-Mustəfa (s) Universitetinin nəşriyyatı

Telefaks: +٩٨ ٢٥١ ٧٧٣٠٥١٧

İran, Qum, Mühəmməd Əmin (s) prospekti, Elmlər Universitetinin nəzdi, Beynəlxalq əl-.Mustəfa (s) Universitetinin nəşriyyatı

Tel/Faks: +٩٨٢٥٣ ٢١٣٣١٠۶ / +٩٨٢٥٣ ٢١٣٣١۴۶

www.miup.ir, www.eshop.miup.ir

E-mail: Admin@miup.ir, Root@miup.ir



səh:١

### İŞARƏ

ƏXLAQ QAYDALARI

(MəSUM IMAMLARıN (ə) NəZəRINDə)

:Müəllif

ŎeYX HüRR AMULI

:Tərcümə edən

MəhəMMəD XəLILOV

səh:٣

**NAŞİRDƏN**

Hər hansı inkişaf mərhələsini keçən elmi-tədqiqi bir iş ilkin olaraq yazıçının ilham zəmisinə səpdiyi sorğu-suallarla başlayıb, müəyyən zamanda verdiyi səmərə ilə yekunlaşır. Əlbəttə, bu işin sonu yox, yeni-yeni fəaliyyətlər üçün ümid və təşəbbüs deməkdir. Belə ki, əldə olunan hər bir səmərəli qazancın məhsuldarlığı həmişə onun artımı üçün şərait yaradır. Demək, zaman keçdikcə elm, bilik, hünər əhli onun .toxumlarını becərib-yetişdirir, daim elm və mədəniyyətin cərəyanını təmin edir

Fasilə və hüdudları həddən artıq azaldan son müasir zamanımız coşqun tufan kimi, maraqlanan hər şəxsin qarşısına qalaq-qalaq məlumatı sovurub gətirir, mədəniyyətin yeni bir mərhələsinə qapı açır. Hər halda onun normal inkişafında, şübhəsiz, düzgün .təsəvvür və istiqamət həlledici rola malikdir

Beynəlxalq əl-Mustəfa (s) Universiteti ümumdünyəvi rolu, dini hövzələr arasında xüsusi yeri və yetdik kadr imkanına malik olduğunu nəzərə alaraq, artıq, elmi

təhqiqat və tədqiqatlar üçün geniş şərait yaratmağı qarşısına qəti məqsəd qoymuşdur. Bununla əlaqədar Beynəlxalq əl-Mustəfa (s) Universitetinin tədqiqat şöbəsi fundamental proqramın təşkili, mövcud avadanlığın düzgün təmini və dini sahələrdə araşdırma aparmaq istəyənlərin cəlb olunmasını özünün ən mühüm vəzifələrindən bilir. Ümid edirik ki, elmi-təhqiqi işlərə qarşı maraq və dirçəlişlərə zəmin yaratmaq və potensial imkanları inkişaf etdirməklə dünyanın hər bir guşəsində dini mədəniyyətin çiçəklənməsinin şahidi olaq!

Beynəlxalq əl-Mustəfa (s) Universiteti

Nəşr və Tərcümə Mərkəzi

## MÜNDƏRİCAT

səh:۱۱

səh:۱۲

səh:۱۴

## ÖN SÖZ

Həmd və pərəstiş, insanları təkamülə və əbədi səadətə doğru yönəltmək, nadanlıq və .azğınlıqdan qurtarmaq üçün peyğəmbərlər göndərən Allahın şəninə məxsusdur

Bütün peyğəmbərlərə, xüsusilə kainatın ağası Həzrət Məhəmmədə (s) və onun əziz !Əhli beytinə (ə) hədsiz salamlar olsun

İnsan həyatda həmişə xoşbəxtlik dalınca olub, təkamülə çatmaq yolunda çalışmış, həmişə həyatın təlatümlü dəryasında bəla və həlakət burulğanından onu qurtarıb xoşbəxtlik sahilinə çatdıra bilən bir rəhbərin dalıncadır. Peyğəmbərlər (ə) tövhid dinlərini təbliğ edənlərdirlər və İlahi qanunlar vəhy yolu ilə onlara nazil olmuşdur. İslamın əziz peyğəmbəri, sonuncu elçi və onun müqəddəs kitabı Quran, bəşərə doğru .yol göstərmək üçün sonuncu səmavi kitabdır

Məsum imamlar (ə) bu risaləti öhdəsinə alanlar, bu karvandakılar isə insanlardırlar və

.onları dünya və axirətə aid həyatın bütün sahələrində doğru yola aparmışlar

Həmçinin, görkəmli və tanınmış İslam alimləri peyğəmbərdən (s), məsum imamlardan (ə) nəql olunmuş hədisləri toplayıb və yayılmasında bütün əsrlər boyu çoxlu .əziyyətlərə qatlaşıb zəhmətlər çəkiblər

İslam hədislərinə aid olan kitablardan biri də hicri tarixi ilə ١١. ci əsrə aid olan dahi və görkəmli alim mərhum əllamə Şeyx Hürr Amulinin topladığı "Vəsailuş-şiə" kitabıdır. O, peyğəmbərdən (s) və məsum imamlardan (ə) nəql olunmuş hədisləri toplamaqla Allahpərəst insanların və İslam alimlərinin yolu qarşısında şölələnmiş bir məşəl .yandırmış, əsrlər boyu elm və ədəb dahiləri də işıq saçan bu məşəldən faydalanırlar

Vəsailuş-şiə" kitabının həcc mövzusunun "Əhkamul-əşrə" bölmələrindəki fiqhə," ictimaiyyətə və əxlaqa aid hədisləri "İslam hədis araşdırmaları" mərkəzində cənab Məhəmməd Əli Farabi və Yəsub Abbasi Əli Kəmər tərcümə ediblər. Ümidvarıq ki, bu .əsər oxucular üçün faydalı olsun və aləmlərin Pərvərdigarı tərəfindən qəbul edilsin

səh:١٨

## ŞEYX HÜRR AMULİNİN HƏYATI HAQQINDA QISA MƏLUMAT

Şeyx Hürr kimi tanınmış Məhəmməd ibn Həsən, görkəmli şiə alimlərindəndir. O, (Livandakı) Cəbəlul-amilin kəndlərindən biri olan Məşğəra kəndində hicri-qəməri tarixi ilə ١٠٣٣. cü il Rəcəb ayının səkkizi cümə axşamında dünyaya gəlib. Bu kənd "Cubə" və "Cizin" məntəqələrinin bir-birinə yaxın olan yerdə yerləşir və qədim şiə .məntəqələrindən sayılır

Şeyx Hürr Amili bu məntəqədə böyük bir elm ailəsində yaşamış və onun əsil-nəsəbi (Həzrət seyiduş-şühədanın (ə) tanınmış səhabəsi) Hürr ibn Yəzid Riyahiyə çatır. O uşaqlıq dövründə atasının, əmisinin, ana tərəfən babasının və digər şəxslərin yanında xəttatlığı, Quran təlimi, müqəddiməni öyrəndikdən sonra elmlə məşğul olmağa başladı. Sonra Məşğəra yaxınlığındakı

Cubə məntəqəsinə yola düşdü və bu məntəqənin alimlərindən elm öyrənməyə başladı. Bu qaydayla o, qırx il həmin məntəqədə qalıb, təlim və tədrislə məşğul oldu. O bu müddət ərzində iki dəfə həcc ziyarəti səfəri şərəfinə nail oldu. Daha sonra o müqəddəs ziyarətgahlar və Həzrət İmam Rizanın (ə) türbətini ziyarət etmək məqsədi ilə səfərə .çıxdı və o həzrətin (ə) türbəti kənarında yaşamaq üçün məskən saldı

Bu mühacirətin səbəbi qeyd olunmayıb. Ancaq o da məlumdur ki, şeyxin yaşadığı dövran səfəvilərin İrandakı hakimiyyətinin qüdrətli vaxtına təsadüf edirdi. Onlar bu ölkədə şiə məzhəbini rəsmi bir din kimi tanımaqdan əlavə, bu təriqət üçün alimlər yetişdirib və onları himayə edirdilər. Digər tərəfdən də Suriya və Livan ətrafındakı şiələr o zamanın təəssübkeşləri tərəfindən sıxıntı içərisində yaşayırdılar. Xüsusilə buna səbəb də Səfəvi hökuməti ilə Osmanlı padşahlığı arasında olan məzhəb ixtilafı özünün son həddinə çatmışdı. Buna əsasən güman edilir ki, şeyxin ölkəsində yaranmış vəziyyət İranda alimlərin sərbəstliyi, elmə verilən dəyər onun cavanlığı dövründə bu məzhəbin yayılması və təbliğinə olan meyli ona həmişəlik Məşhəd şəhərində yaşamağı .və buranı öz vətənində yaşamaqdan üstün tutmasına səbəb olsun

Şeyx bu vilayətdə məskən salıb hədislərin yayılmasına, digərlərinin ondan faydalanması üçün çalışdı və bir neçə şagirdlər yetişdirdi. O Məşhəddə yaşadığı .müddətdə iki dəfə həcc ziyarətinə gedib

## ŞEYXİN ƏSƏRLƏRİ

Şeyx iyirmiyə yaxın risalə və kitab yazıb, "Vəsailuş-şiə" də onlardan biridir. Bu kitab yetmiş kitabdan toplanıb və İranda, Beyrutda iyirmi cilddə çap olunmuşdur. Şeyx "Vəsailuş-şiə" kitabını iyirmi il müddətində yazmaqla şəri hökmləri əldə etməyi çox asanlaşdırmışdır. Buna görə də onun şiənin fiqh məktəbində çox böyük rolu vardır. Şeyx fiqhdə, ricalda və riyaziyyatda elm dəryası idi və bu zəminədə bir çox kitablar yazmışdır. Həmçinin o kifayət qədər şer yazmağı da bacarırdı. O, özünün elmi məharətindən istifadə edib müxtəlif fənləri o cümlədən zəkatı bölməsini, həndəsə elmini, peyğəmbərin (s) və məsum imamların (ə) tarixini nəzmə almışdır.

O, ۱۱۰۴. cü hicri-qəməri ilində vəfat etmişdir. Onun qəbri imam Əli ibn Musa Rizanın (ə) ziyarətgahı kənarında Mirzə Cəfər mədrəsəsinin hücrələrindən birindədir.

## SƏFƏRDƏ, VƏTƏNDƏ ƏDƏB QAYDALARI VƏ BU BİR NEÇƏ BÖLMƏDƏN İBARƏTDİR

### Camaatın əmanətini qaytarmaq,...qaydalarına aid bölmə۱

CAMAATıN əMANəTINI QAYTARMAQ, DüZ DANışMAQ, şAhID DURMAQ, həMçININ .۱ XəSTəYə BAş çəKMəK, CəNAZəNIN DəFNINDə IşTIRAK eTMəK, QONşULARLA YAXşı RəFTAR eTMəK, MəSCIDDə NAMAZ QıLMAQ BARəSINDəKI əXLAQ QAYDALARıNA AID BöLMə

Muaviyə ibn Vəhəb deyir ki, imam Sadiqə (ə) ərz etdim: "Qohumlarla və əlaqəmiz .۱ "?olduğu adamlarla necə rəftar etməliyik

İmam (ə) buyurdu: "Onların əmanətlərini qaytarın, istər xeyrinizə və istərsə də zərərinizə olsa belə, (haqqa) şahid durun, onların xəstələrinə baş çəkin, ölənlərin (cənazəsinin dəfnində iştirak edin."(۱)

Əbi Üsamə Zeyd Şəhham deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Mənə itaət edib .۲ sözlərimə əməl



---

.(Üsuli Kafi, səh.۶۰۸, ("Ma yəcibu minəl-muaşirəti" bölməsi . [۱] -۱

edənlərə salam çatdırın və onlara deyin: Sizi Allah Əzzəvəcəll qarşısında təqvalı olmağa, dində pərhizkarlığa, Allah yolunda çalışmağa, düz danışmağa, əmanəti sahiblərinə qaytarmağa, çox səcdədə qalmağı və qonşularla yaxşı rəftar etməyi nəsihət edirəm. Çünki Həzrət Məhəmməd (s) də həmin məqsəd üçün məbus olmuşdur. Sizə etimad edənlərin istər pis, istərsə də yaxşı olsun əmanətini qaytarın. Çünki Rəsulullah (s) hətta iynə və sap (zahirən dəyərsiz olsa da belə) üçün də fərman vermişdir. Sileyi-rəhm edin (qohumlarla əlaqə yaradın), cənazənin dəfnində iştirak edin, xəstələrə baş çəkin və haqqları yerinə yetirin. Çünki sizlərdən o kəsə cəfəri məzhəbi deyilir ki, dinində təqvalı, düz danışan, əmanətdar və camaatla yaxşı rəftar etmiş olsun. Belə şəxs bu cür əməlləri ilə məni şad edir. Bu cəfəri məzhəbinin .qaydasıdır

Əgər bizim şiələr bu xasiyyətə malik olmasalar mənim üçün baş xəcalətidir və camaat deyər: Bu da imam Cəfər Sadiqin (ə) dinidir. And olsun Allaha! Atam (imam Baqir) mənə buyurdu ki, Həzrət Əlinin (ə) ardıcıllarından hər kəsdən çox əmanəti sahibinə qaytaran, haqqa riayət edən, danışıq və əmanətdə hamıdan doğru olan kəs qəbiləsinin zinətidir. Belə ki, əgər hər kəsdən onun barəsində soruşanda desələr (filankəs kimi olmaq lazımdır, çünki o bizdən daha çox düz danışan və əmanətçildir."(١



.Həmin mənbə . [۱]-۱

3. Muaviyə ibn Vəhəb deyir: "İmam Sadiqə (ə) ərz etdim ki, bizim məzhəbdən olmayan qohumlarla və əlaqədə olduğumuz adamlarla necə rəftar edək?"

İmam (ə) buyurdu: "Təqlid etdiyiniz özünüzdən qabaqkı insanlara baxın və onlar rəftar etdikləri kimi siz də əməl edin. And olsun Allaha! Sizdən qabaqkı insanlar onların xəstələrinə baş çəkərdilər, dəfnlərində iştirak edərdilər, istər zərərlərinə olsun istərsə də xeyirlərinə, (haqqa) şahid durardılar və əmanətlərini onlara qaytarardılar."(1)

4. Həbib Xəsəmi deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Sizə günahlardan çəkinməyi, çalışmağı, cənazənin dəfnində iştirak etməyi, xəstələrə baş çəkməyi, camaatla birlikdə məsciddə olmağı və özünüz üçün bəyəndiyinizi başqaları üçün də bəyənməyi tövsiyə edirəm. Sizin içərinizdən olan kəs utanmır ki, qonşusu onun haqqını tanısın, o isə qonşunun haqqına riayət etməsin?"(2)

5. Murazim deyir ki, imam Cəfər Sadiq (ə) buyurdu: "Sizə məscidlərdə namaz qılmağı, camaatla yaxşı rəftar etməyi, (haqqı isbat etmək üçün) şahid durmağı və cənazənin dəfnində iştirak etməyi tövsiyə edirəm. Çünki, sizin camaata mütləq ehtiyacınız var və heç kim həyatda camaatdan ehtiyacsız olmaz."(3)



---

1- [1]. "Ma yəcibu minəl-muaşirə" bölməsi ("Üsuli Kafi səh.608).

2- [2]. Həmin mənbə.

3- [3]. Həmin mənbə.

۶. Abdulla ibn Sənan deyir ki, imam Sadiq (ə) buyurardı: "Sizə İlahi təqvanı tövsiyə edirəm, camaatı özünüzə qalib etməyin xar olarsınız. Şübhəsiz, Allah Əzzəvəcəll Qurani-kərimdə buyurur: "İnsanlarla xoş dillə danışın və yaxşı rəftar edin."(۱)

Həzrət (ə) daha sonra buyurdu: "Onların xəstələrinə baş çəkin, cənazələrinin dəfnində iştirak edin, əgər zərərlərinə, ya da xeyirlərinə olsa belə şahidlik edin, sizinlə onlar arasında olan fərqinizin bilinməsi üçün məscidlərində namaz qılın."(۲)

۷. Xeysəmə deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Mənim salamımı bizim dostlarımıza çatdır, onları Allahdan qorxuz və yaxşı əməli onlara nəsihət et, sağlam insanlar xəstələrə baş çəksinlər, sərvət sahibləri yoxsullara diqqət yetirsinlər, ölənlərin cənazələrinin dəfnində iştirak etsinlər, bir-birlərinin evlərinə gedib gəlsinlər və dini işlərdə bir-birləri ilə müzakirə etsinlər. Çünki bunlara riayət etmək bizim dinimizin əbədi qalmasına səbəb olur və Allah bizim dinimizi dirçəldən bəndəyə rəhmət etsin. Ey Xeysəmə! Onlara anlat ki, onları Allahdan qeyrisinə ehtiyacsız edən təkcə bir şey yaxşı və bəyənilmiş əməldir. Çünki bizim dostluğumuza və vilayətimizə vərə (təqvalı olmaq və İlahi qanunlara riayət etmək) və pərhizkarlıqdan başqa bir şeylə nail

səh:۲۸

---

۱- [۱]. Bəqərə surəsi, ayə ۸۳.

۲- [۲]. Sərair, səh.۴۷۵; Məhasin Bərqi səh.۱۸.

olmaq olmaz. Qiyamət günündə əzab olunanlar, haqq və ədaləti dərk edib, daha sonra onun əksinə əməl edənlərdir."(1)

8. Kəsir ibn Əlqəmə deyir: "İmam Sadiqə (ə) ərz etdim ki, mənə nəsihət versin. O həzrət (ə) buyurdu: Sənə İlahi təqvanı, pərhizkarlığı, ibadəti, uzun səcdəni, əmanəti qaytarmağı, doğru danışmağı və qonşularla yaxşı rəftar etməyi nəsihət edirəm. Çünki Həzrət Məhəmməd (s) bu məqsəd üçün məbus olmuşdur. Qohumlarınızla əlaqə yaradın, xəstələrə baş çəkin, ölənlərinizin cənazəsinin dəfnində iştirak edin, bizə üz xəcaləti yox fəxr və zinət olun, əməllərinizlə bizi camaatın yanında əziz və sevimli edin, onları bizə qarşı düşmən etməyin, bütün məhəbbətləri bizə tərəf cəlb edin və bizə qarşı olan hər hansı bir pis danışığı bizdən uzaqlaşdırın."(2)

9. İmam Sadiq (ə) nəql edir ki, Həzrət Əli (ə) buyurardı: "Gərək sənin qəlbində camaata olan ehtiyacınla onlardan olan ehtiyacsızlığın cəmləşsin. Sənin onlara olan ehtiyacın mülayim danışmağın və yaxşı rəftarındır, sənin onlardan olan ehtiyacsızlığın isə paklığının və izzətinin möhkəm qalmasındadır."(3)

10. Əbu Üsamə deyir ki, imam Sadiq (ə) buyurmuşdur: "Sizə İlahi təqvanı riayət etməyi, pərhizkarlığı, çalışmağı, doğru danışmağı, əmanəti



---

1- [1]. Sərair, səh.487.
2- [2]. Həmin mənbə.
3- [3]. Məaniyul-əxbar, səh.77.

sahibinə qaytarmağı, yaxşı əxlaqı və qonşularla yaxşı rəftar etməyi tövsiyə edirəm. Bizim üçün zinət və abır-həya olun, bizim abır-həyamızın aradan getməsinə səbəb olmayın."(۱)

## Qonşularla və camaatla yaxşı rəftar etməyin müstəhəbliyinə .۲

۱. İmam Baqir (ə) buyurdu: "Əgər əlaqən olduğu adamlardan üstün olmaq istəyirsənsə, bu əməli (yaxşı rəftarı) et."(۲)

۲. İmam Cəfər Sadiq (ə) buyurdu: "Özünü oturub-durduğun adamla yaxşı rəftar etmək üçün hazırla, əxlaqını gözəlləşdir, dilini qoru, qəzəbini cilovla, yersiz sözləri tərk et, əfv etməyi bacar və bağışlayan ol."(۳)

۳. Əbu Rəbi Şami deyir ki, İmam Sadiqin (ə) hüzuruna gəldim. O həzrətin (ə) evi cəmiyyətlə dolu idi. həzrət (ə) buyurdu: "Ey Məhəmməd əhli-beytinin (ə) şiələri, agah olun! Qəzəbləndiyi zaman özünə hakim olmayanlar, dostları ilə yaxşı rəftar etməyənlər, onlara qarşı yaxşı əxlaqı olanlarla mehriban davranmayanlar, oturub-durduqları şəxslərlə rabitələri yaxşı olmayanlar, qonşularla yaxşı rəftar etməyənlər və duz-çörəyə riayət etməyənlər bizdən deyillər."(۴)



---

۱- [۱] . Məhasin Bərqi, səh.۱۸.
۲- [۲] . Üsul Kafi, səh.۶۰۹ və ۶۲۵.
۳- [۳] . Üsuli Kafi, səh.۲۴۵.
۴- [۴] . Üsuli Kafi, səh.۶۰۹ və ۲۴۵; Əl-Məhasin, səh.۳۷۵; Mən la yəhzuruhul-fəqih, ۱-ci cild, səh.۹۸.

۴. İmam Baqir (ə) buyurdu: "Allah evinin zəvvarının əgər bu üç xisləti olmasa mükafat və savabı yoxdur: ۱. Onu Allahın itaətsizliyindən saxlayan pərhizkarlıq. ۲. Qəzəbinin qarşısını ala bilən mülayimlik (həlimlik). ۳. Oturub-durduğu kəslərlə yaxşı rəftar etməyi."(۱)

۵. İmam Sadiq (ə) nəql edir ki, atam buyurdu: "Allah evini ziyarət edən kəsdə bu üç xislət olmasa, mükafatı olmaz: ۱. Dostu ilə yaxşı rəftar edəcəyi əxlaqı. ۲. Qəzəbinin qarşısını ala bilən mülayimlik və səbr. ۳. Onu Allahın haramlarından çəkindirən pərhizkarlığı."(۲)

۶. İmam Sadiq (ə) buyurdu: "İnsanın səfərdə öz səfər yoldaşından gördükləri pis və yaxşı şeyləri açıb demək mürüvvətdən deyil."(۳)

۷. Əmmar ibn Mərvan deyir ki, imam Cəfər Sadiq (ə) mənə nəsihət etdi və buyurdu: "Sənə pərhizkarlığı, əmanəti sahibinə qaytarmağı, doğru danışmağı və oturub-durduğun şəxslə yaxşı rəftar etməyi tövsiyə edirəm. Bütün güc və qüdrət Allahdandır."(۴)



---

۱- [۱]. Üsuli Kafi, səh.۲۴۴; Xisal, ۱-ci cild, səh.۷۲.

۲- [۲]. Üsuli Kafi, ۲-ci cild, səh.۵۷۴; Mən la yəhzuruhul-fəqih, ۱-ci cild, səh.۱۸.

۳- [۳]. Mən la yəhzuruhul-fəqih, ۱-ci cild, səh.۹۸; Məhasin Bərqi, səh.۳۵۸.

۴- [۴]. Mən la yəhzuruhul-fəqih, ۱-ci cild, səh.۹۸; Üsuli Kafi, səh.۶۲۵; Məhasin Bərqi, səh.۳۵۸.

۸. Müfəzzəl ibn Ömər deyir ki, imam Sadiqin (ə) hüzuruna gəldim. həzrət (ə) mənə buyurdu: "Sənin oturub-durduğun şəxs kimdir?"

Ərz etdim: "Mömin qardaşlarımdan biri."

həzrət (ə) buyurdu: "O nə iş görər?"

Ərz etdim: "Onunla tanış olandan bəri yerini bilmirəm."

Həzrət (ə) mənə buyurdu: "Bilmirsən ki, hər kim qırx qədəm bir möminlə gəzərsə, Allah-taala qiyamət günü onun haqqında soruşacaq?"(۱)

۹. İmam Sadiq (ə) öz atalarından nəql edir ki, Rəsulullah (s) buyurub: "hər kimdə bu üç xislət olmasa onun əməli kamil deyil: ۱. Onu Allah qarşısında etdiyi günahdan saxlayan təqva. ۲. Camaatla yaxşı rəftar etdiyi əxlaqı. ۳. Nadan insandan cəhalətini aparan onun səbri."(۲)

۱۰. Seyid Rəzi "Nəhcül-bəlağə" kitabında Həzrət Əmirdən (ə) nəql edir: "Camaatla elə rəftar edin ki, əgər ölsəniz sizin üçün ağlasınlar və əgər onlardan uzaqlaşsanız sizinlə görüşmək arzusunda olsunlar."(۳)

## ۳. Müxtəlif dostlarla əlaqə saxlamağa aid bölmə

۱. İmam Cavad (ə) buyurur ki, Bəsrədə Həzrət Əlinin (ə) hüzurunda bir kişi ayağa qalxdı və ərz etdi: "Dostların növləri haqqında bizə xəbər ver."



---

۱- [۱]. Məcalis, Səduq səh.۳۶۳.
۲- [۲]. Məhasin Bərqi, səh.۶.
۳- [۳]. Nəhcül-bəlağə, ikinci hissə, səh.۱۴۵.

Həzrət (ə) buyurdu: "Dostlar iki dəstədirlər: Etimadlı dostlar və gülərüz dostlar. Etimadlı dostlar insanın əlinin ovucu, qolları, ailə üzvləri və əmlakı kimidirlər. Əgər sən qardaşına etimad edirsənsə, maddi və mənəvi köməyini ondan əsirgəmə, onun dostları ilə xalis dostluq et, düşmənlərini də düşmən bil, sirrini gizlət, ona kömək et və yaxşılıqlarını açıq de. Bil ki, bunlar qırmızı kibritdən də azdırlar.

Amma gülərüz dostlarınla isə əlaqə yaratdıqda sən onlardan ləzzət alırsan. Onlarla rabitəni kəsməklə özünü bu ləzzətdən məhrum etmə, onlardan çox intizarın olmasın, onlarla gülərüz və şirin dillə rəftar et."(۱)

**۴. Müstəhəbliyə aid bölmə**

a) Yay fəslində (məclislərdə) iki nəfərin arasındakı məsafə bir zira (yarım metr) olmalıdır

b) Zəiflərə və ehtiyacı olan insanlara yardım

İmam Sadiq (ə) Qurani-kərimdəki "Həqiqətən biz səni yaxşılıq edənlərdən . ۱ görürük"(۲) ayəsinin izahında buyurdu: "Həzrət Yusif (ə) məclisdə başqaları üçün yeri geniş edərdi, ehtiyaclı insanlara borc verərdi və zəiflərə kömək edərdi."(۳)

səh:۳۳

---

۱- [۱] . Xisal, Səduq ۱-ci cild, səh.۲۶; Məsadiqul-ixvan, səh.۲; Üsuli Kafi, səh.۴۳۲.

۲- [۲] . Yusif surəsi, ayə ۷۸.

۳- [۳] . husnul-muaşirə) Üsuli Kafi, səh.۶۰۹).

۲. İmam Cəfər Sadiqdən (ə) nəql olunmuşdur ki, Rəsulullah (s) buyurub: "Bir məclisdə oturan şəxslər üçün yaxşı olardı ki, yayda bir zira (təqribən yarım metrə) qədər bir-birlərinə maneçilik yaratmamaq üçün fasilə saxlasınlar."(۱)

## ۵. Dostlara ehtiram etməyin və onlara nəsihət verməyin müstəhəbliyinə aid bölmə

۱. Əbül-Həsən imam Musa Kazim (ə) buyurdu: "İnsanı özünün olduğu yerdə künyəsi ilə, özünün olmadığl yerdə isə adı ilə yad edin."(۲)

۲. Əla ibn Fuzeyl imam Sadiqdən (ə) nəql etmişdir ki, imam Baqir (ə) buyurub: "Dostlarınızı əzizləyin, ehtiram edin, bir-birinizə qəzəblənməyin, bir-birinizə zərər vurmayın, həsəd aparmayın, paxıllıqdan pərhiz edin və Allaha xalis bəndələr olun."(۳)

## ۶. Camaat qarşısında qaşqabaqlı olmağın məkruhluğuna aid bölmə

۱. İmam Baqir (ə) yaxud imam Sadiq (ə) buyurdu: "Camaatla qaşqabaqlı olmaq düşmənçiliyə bais olur."(۴)

## ۷. Dost tapmağa...aid bölmə

۷. DOST TAPMAĞA DOSTLARLA üNSIYYəT YARATMAğA Və ONLARıN eTIRAZLARıNı QəBUL eTMəYə AID BöLMə

۱. Məhəmməd ibn Yəzid deyir ki, imam Rizadan



---

۱- [۱]. Babul-culus) Üsuli Kafi, səh.۶۲۱.

۲- [۲]. Babun-nəvadir fi axiril-kitab) Üsuli Kafi, səh.۶۲۶.

۳- [۳]. Babu husnul-muaşirə) Üsuli Kafi, səh.۶۰۹.

۴- [۴]. Babul-muaşirə) Üsuli Kafi,.

ə) eşitdim buyurdu: "Hər kim Allah yolunda bir dost taparsa, cənnətdə bir ev) (qazanıbdır."(١)

Şeyx Səduq "Məcalis" kitabında nəql etmişdir ki, Loğman oğluna dedi: "Əziz oğlum! .٢ Özünə min dost seç. Min dost da azdır və bir dənə də olsun belə düşmənin olmasın. (Çünki bir düşmən də çoxdur."(٢)

Həzrət Əli (ə) buyurdu: "Sənə xalis dostlar seçməyi tövsiyə edirəm. Çünki hər zaman .٣ .onlardan kömək istəsən, onlar sənin arxa və köməyin olacaqlar

".Bir dost və həmdəm çox deyil, ancaq bir düşmən olsa da belə çoxdur

(Əl-İxvan kitabında bu hədis imam Sadiqdən (ə) nəql olunmuşdur.(٣)

O həzrət (ə) Rəsulullahdan (s) nəql edir ki, həzrət (s) buyurdu: "Hər kim özündən .۴ ".qabaq axirəti üçün azuqə göndərməsə, cənnətə daxil olmayacaq

"?Soruşdular: "Ey Allahın Rəsulu! Gərək hər kəs qabaqcadan azuqə göndərməlidir

(Həzrət (s) buyurdu: "Din qardaşı onun axirət azuqələrindən biridir."(۴)

İmam Cəfər Sadiq (ə) buyurdu: "Özünüzün dünyadakı dostlarınızı çoxaldın. Çünki .۵ onlar dünyada, axirətdə faydalıdırlar və insanın dünyadakı ehtiyacları onlara bağlıdır. Amma



---

.Səvabul-əmal, səh.٨٣; Üsuli Kafi, səh.١٨ . [١] -١

.Məcalis, Səduq səh.٣٩٧ . [٢] -٢

.Məcalis, Səduq səh.٣٩٧ . [٣] -٣

.Məsadiqətul-ixvan, səh.۴ . [۴] -۴

axirətdə isə cəhənnəm əhli deyərlər: Bizim şəfaət edənimiz və yaxınımız yoxdur."(۱) (۲)

۶. İmam Sadiq (ə) buyurdu: "Öz dostlarınızı çoxaldın. Çünki, hər bir möminin qəbul olunmuş duası vardır."

Həzrət (ə) buyurub: "Çoxlu dost tapın. Çünki, hər bir mömin üçün şəfaət (vasitəçilik) haqqı vardır."

Həmçinin buyurub: "Mömin qardaşlarınızı çoxaldın. Çünki, onlar üçün Allah yanında qiyamət günü şəfaət etmək üçün vasitə olan bir əl vardır."(۳)

۷. Seyid Rəzi "Nəhcül-bəlağə" kitabında deyir ki, əmirəlmöminin (ə) buyurdu: "Bacarıqsız və zəif insan o kəsdir ki, dost tapmaqda acizdir. Ondan da bacarıqsız və zəif insan o kəsdir ki, tapdığı dostu itirsin."(۴)

۸. Şeyx Tusi Məcalis kitabında imam Sadiqdən (ə), o da Əli ibn Əbi Talibdən (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Mömin dəyərli və uca fikrli, münafiq isə hiyləgər və alçaqdır. Daha yaxşı və imanlı insanlar o kəslərdir ki, möminlərlə ünsiyyət qursun. Başqaları ilə ünsiyyət qurmayan və başqaları da onunla ünsiyyətdə deyillərsə, o insanda heç bir xeyir yoxdur."

Həmçinin Həzrət Əli (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "İnsanların ən pisi o kəsdir ki, möminlərlə düşmənçilik etsin və onlar da onu qəlblərində düşmən



---

۱- [۱]. Şüəra surəsi, ayə ۲۶.

۲- [۲]. Məsadiqul-ixvan, səh.۱۸.

۳- [۳]. Məsadiqul-ixvan, səh.۱۸.

۴- [۴]. Nəhcül-bəlağə, ۲-ci hissə, səh.۱۴۵.

bilsin. Camaatın da daha pisi isə söz gəzdirən və dostlar arasında ayrılıq salan, camaatın eybini axtaranlardır. Allah qiyamət günü onlara rəhmət nəzəri ilə ".baxmayacaq və məqamlarını ucaltmayacaq

Daha sonra Həzrət Əli (ə) bu ayəni buyurdu: "Səni Öz (qeyb) köməyi və möminlərin (vasitəsilə qələbəyə çatdıran Odur. Onların qəlbləri arasında ülfət yaratdı."(۱) (۲

Əyyub ibn Nuh deyir ki, imam Əliyyən-Nəqi (ə) dostlarından bəzisinə yazdı: "Filan .۹ kəsi danla və ona de: Allah bir bəndəsi üçün xeyir və yaxşılıq istəyəndə, o danlanar, (danlamağı qəbul edər və tənbih olunar."(۳

**Ağıllı, bağışlayan insanla...aid bölmə .۸**

OTURUB-DURMAQ Və SəVIYYəSIZ NADANDAN UZAQLAşMAğıN MüSTəhəBLIYINə AID BöLMə

İmam Sadiqdən (ə) nəql olunur ki, əmirəlmöminin (ə) buyurdu: "Ağıllı insan hərçənd .۱ ki, bağışlayan olmasa da belə, onunla əlaqə yarat, ağlından istifadə et, pis əxlaqından özünü qoru. Əliaçıq dostun ağlından faydalanmasan da onu tərk etmə, lakin öz ağlınla (onun səxavətli olmasından faydalan və səviyyəsiz nadandan da mütləq qaç qurtar."(۴



---

.Ənfal surəsi, ayə ۶۲ . [۱] -۱

Şeyx Tusinin "Məcalis" kitabı, səh.۲۹۵. Orada deyilir: Fasiq şəxs alçaqdır və söz . [۲] -۲ .gəzdirəni Allah Öz rəhmətindən uzaq etsin

.Sərair, səh.۴۷۱ . [۳] -۳

.Üsuli Kafi, səh.۶۰۹ . [۴] -۴

## ۹. Ağıllı insanla məsləhətləşməyin müstəhəbliyinə aid bölmə

۱. Əbu Hüreyrə deyir ki, Rəsulullah (s) buyurub: "Ağıllı insandan məsləhət alın və itaətsizlik etməyin, yoxsa peşman olarsınız."(۱)

## ۱۰. Dostlarla görüşüb və söhbət etməyin müstəhəbliyinə aid bölmə

۱. Əl-İxvan" kitabında deyilir ki, imam Sadiq (ə) (şiələrdən birinə) buyurdu: "(Siz dostlar və şiələr) bir-birinizlə bir yerdə oturub və söhbət edirsinizmi?"

Ərz etdim: "Bəli."

Həzrət (ə) buyurdu: "Bu məclisləri mən çox sevirəm, elə isə (bizim müsibətlərimiz və din hökmləri barəsində) bizim sözlərimizi və fəzilətlərimizi yaşadın. hər kim bizim fəzilətlərimizi nə qədər çox yaşadarsa, Allah ona rəhmət etsin. hər kəs bizi yad edərsə, yaxud onun yanında bizi xatırlayanda milçəyin qanadı qədər gözündən yaş axarsa, onun günahları dənizin köpüyündən nə qədər çox olsa da, Allah bağışlayar."(۲)

۲. Məysər deyir ki, imam Məhəmməd Baqir (ə) mənə buyurdu: "Heç bir-birinizlə xəlvətə çəkilib söhbət edirsiniz?"

Ərz etdim: "And ola Allaha, bəli!"



---

۱- [۱]. Şeyx Tusinin "Məcalis" kitabı, səh.۹۴.

۲- [۲]. Məsadiqətul-ixvan, səh.۶.

Həzrət (s) buyurdu: "Allaha and içirəm ki, sizin bu yığıncaqlarınızdan bəzisində çox istəyirəm iştirak edəm."(۱)

۳. İmam Baqir (ə) buyurdu: "Allah bizim xatirəmizi yaşadan şəxsi bağışlasın."

Bunu eşidən bir şəxs soruşur: "Sizin xatirənizi yaşatmağın qaydası necədir?"

Həzrət (ə) buyurdu: "Bir-birlərinin (möminlərin) və əqidəsi sabit insanların yanında bir-birləri ilə söhbət etməkdir."(۲)

۴. İmam Sadiq (ə) nəql edir ki, həzrət Əli (ə) buyurdu: "Dostların görüşləri daha dəyərli qənimətdir."(۳)

۵. Fuzeyl ibn Yəsair deyir ki, imam Baqir (ə) buyurdu: "Heç bir-birlərinizlə bir yerdə toplanırsınızmı?"

Ərz etdim: "Bəli."

Həzrət (ə) buyurdu: "Bu məclislər necə də yaxşıdır."(۴)

۶. Xeysəmə deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Bizim dostlarımıza salam çatdır və onlara İlahi təqvanı tövsiyə et, varlılar yoxsullarla, güclülər zəiflərlə görüşsünlər, dirilər dünyadan gedənlərin cənazələrinin dəfnində hazır olsunlar və bir-birlərinin evlərinə gedib gəlsinlər. Çünki onların görüşləri bizim fəzilətlərimizin və dini hökmlərin yaşamasına səbəbdir."



---

۱- [۱]. Məsadiqul-ixvan, səh.۴.

۲- [۲]. Məsadiqətul-ixvan, səh.۶.

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Həmin mənbə.

Həzrət (ə) daha sonra buyurdu: "Allah bizim fəzilətlərimizi və dini hökmləri yaşadan bəndəsinə rəhmət etsin."(۱)

۷. İmam Sadiq (ə) atalarından nəql edir ki, peyğəmbər (s) buyurdu: "Üç şey möminin rahatlığıdır: Gecə yarısı oyaq qalmaq, dostlarla görüşmək və oruc tutanda iftar etmək."(۲)

۸. Şüeyb Əqərqufi deyir ki, imam Sadiq (ə) dostlarına buyurdu: "Təqvalı olun, Allahın razılığı üçün xeyirxah qardaşlar olun və bir-birinizi sevin, bir-birinizə bağlanın və mehriban olun, bir-birinizin ziyarətinə gedin və görüşün, bizim fəzilətlərimizi yada salın və onu yaşadın."(۳)

۹. İmam Baqir (ə) buyurdu: "Bir yerə toplanın, bir-birinizlə (dinə aid işlər barəsində) söhbət edin. (Belə olan halda) mələklər sizin ətrafınıza toplanarlar. Allah bizim fəzilətlərimizi (dinə aid məsələləri) yaşadanı bağışlasın."(۴)

## ۱۱. Yaxşı insanlar və qədim dostlarla...aid bölmə

۱۱. YAXşı INSANLAR Və QəDIM DOSTLARLA RABITə YARATMAğıN MüSTəhəBLIYINə Və PIS INSANLARDAN UZAQLAşMAğA AID BöLMə

۱. Üsuli Kafi kitabında həzrət Əlidən (ə) nəql olunub ki, Rəsulullah (s) buyurdu: "Söhbət etdiyiniz



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. Həmin mənbə.

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Həmin mənbə, səh.۱۰.

və oturub durduğunuz) adamların barəsində diqqət edin. Çünki hər kəsin ölüm vaxtı) çatanda dostları onun yanında hazır olarlar. Əgər onlar yaxşı insanlardırlarsa, elə isə o da yaxşıdır və əgər pis olarlarsa, (məlum olur ki) o da həmçinin pisdir. hər kəsin ölüm (zamanı çatarsa, dostları onun müqabilində görsənər." (١

Əbul-Həsən imam Musa Kazım (ə) buyurmuşdur ki, Həzrət İsa (ə) deyibdir: "Pis dost .٢ dostuna zülm edər və pis yoldaş onu həlakətə aparar. Elə isə bax gör sən kimlə (oturub-durursan."(٢

İmam Sadiq (ə) dostlarından birinə buyurdu: "Səni keçmiş dostlarını dost seçməyə .٣ tövsiyə edirəm və vəfadar, əmanətçil, əhd-peymana sadiq olmayan hər hansı təzə (dostdan uzaq gəz, hətta daha etibarlı dostlarınla ehtiyatlı rəftar et."(٣

"?İbn Abbas deyir: "Rəsulullahdan (s) soruşdular ki, daha yaxşı dost kimdir .۴

Həzrət (s) buyurdu: "Görüşəndə sizə Allahı yada salan, danışığı yaxşı əməlinizi (çoxaldan və əməli də sizə axirəti xatırladan kəsdir."(۴

İmam Sadiq (ə) buyurdu: "Sənin dini mənfəətini nəzərə almayan kəsə yaxınlaşma və .۵ -onunla oturub



---

.(Üsuli Kafi, səh.۶١٠ (Mən yəcibu musadiqətuhu və musahibətuhu . [١] -١

.Üsuli Kafi, səh.۶١١ . [٢] -٢

.Üsuli Kafi, səh.۶١٠ . [٣] -٣

.Məclis, Səduq səh.٩٧ . [۴] -۴

durmağa maraq göstərmə. Çünki Allahdan savayı hər bir şey aradan gedəndir və sonu çox təhlükəlidir."(١)

**Nəsihəti qəbul etməyin və...aid bölmə .١٢**

١٢. NəSIhəTI QəBUL eTMəYIN Və NəSIhəT eTMəK MəQSəDILə eYBINI BILDIYI INSANLA əLAQə YARATMAğıN MüSTəhəBLIYINə AID BöLMə

١. Əbu Udeys deyir ki, imam Baqir (ə) buyurdu: "Ey Saleh! Qəlbi sənin üçün yanıb sənə nəsihət verən şəxsə itaət et və səni güldürən lakin sənə hiylə gələn şəxsə itaət etmə. Tezliklə hamınız Allaha tərəf qayıdacaqsınız. O zaman agah olarsınız (ki, kim sizin xeyirxahınız və kim sizin pisliyinizi istəyən olub)."(٢)

٢. İmam Sadiq (ə) buyurdu: "Mənə daha əziz olan dostlarım o kəslərdir ki, mənim eyblərimi mənə desin."(٣)

٣. Bərqinin (Məhasin) kitabında imam Cəfər Sadiqdən (ə) nəql olunubdur: "Möminin ehtiyacı olduğu xislətlər üç şeydir: ١. Allah Əzzəvəcəll tərəfindən olan tofiq (müvəffəqlik). ٢. İnsanın özü-özünə moizə etməsi. ٣. Nəsihəti qəbul etmək."

**Dostluğu riayət edən, giriftarçılığı...aid bölmə .١٣**

١٣. DOSTLUğU RIAYəT eDəN, GIRIFTARçıLığı ZAMANı ONU TəNhA QOYMAYAN KəSLə DOSTLUQ eTMəYIN MüSTəhəBLIYINə AID BöLMə

١. İmam Sadiq (ə) buyurdu: "Dostluğun bir neçə şərti vardır. hər kim bütün bu şərtlərə, yaxud



---

١- [١]. Qurbul-əsnad, səh.٢٥.

٢- [٢]. Üsuli Kafi, səh.٦١٠.

٣- [٣]. Həmin mənbə.

bunlardan bəzisinə riayət edərsə, onu dost saymaq olar və əgər bir kəsdə bu şərtlər olmasa onu dost hesab etmək olmaz. O şərtlər bunlardan ibarətdirlər: ۱. Batinlə zahirin eyni olması, ۲. Sənin izzətini öz izzəti və eybini də öz eybi bilməsi, ۳. Əgər o bir məqam və sərvətə sahib olarsa, onda heç bir dəyişiklik yaranmasın, ۴. Onun qüdrəti və imkanı olanda səni heç bir şeydən məhrum etməsin, ۵. Bu xislətlərə malik olan şəxs səni (giriftarçılığın zamanı tərk etməz."(۱

Seyid Rəzi "Nəhcül-bəlağə" kitabında Həzrət Əlidən (ə) nəql edir ki, o həzrət (ə) .۲ buyurdu: "Həqiqi dost odur ki, öz qardaşını üç yerdə qorusun: Giriftarçılıqda, hüzuru ".olmayanda və ölümündən

**Dostların bir-birinə kömək və...aid bölmə .۱۴**

DOSTLARıN BIR-BIRINə KöMəK Və YARDıM eTMəSININ MüSTəhəBLIYINə AID .۱۴ BöLMə

Vəssafi deyir ki, imam Məhəmməd Baqir (ə) mənə buyurdu: "Heç elə bir insan .۱ tanıyırsan ki, paltarı olmayanda qardaşı öz paltarını ona bağışlasın, yaxud artıq paltarı "?olarsa o paltar tapana kimi müvəqqəti olaraq öz paltarını ona versin

".Ərz etdim: "Xeyr

İmam (ə) təəssüf əlaməti olaraq əllərini dizlərinə vurdu və buyurdu: "Belə insanlar (qardaş deyillər."(۲



---

.Üsuli Kafi, səh.۶۱۰; Məsadiqul-ixvan, səh.۲ .[۱]-۱

Məsadiqul-ixvan, səh.۸ .[۲]-۲

İshaq ibn Əmmar deyir ki, imam Sadiqin (ə) yanında idim və qardaşların bir-birinin .۲ qarşısında olan vəzifələri və köməyi barəsində söz açıldı. İmam (ə) elə bir söz buyurdu ki, mən təəccüb etdim. Həzrət (ə) buyurdu: "Bizim qaimimiz zühur edəndə möminlərə vacibdir ki, qardaşlarının ehtiyaclarını ödəsinlər və onların sevinməsi üçün (çalışsınlar."(۱)

Xəllad Sindi (ravisi bilinməyən bir hədisdə) deyir ki, bir kişi Peyğəmbərin (s) hüzuruna .۳ "?gec gəldiyindən peyğəmbər (s) ona buyurdu: "Niyə səninlə az görüşürük

O cavab verdi: "Ey Allahın Rəsulu! Paltarsızlıq mənim sizin yanınıza gəlməyimə mane ".idi

"?Peyğəmbər (s) buyurdu: "Qonşunun iki paltarı yoxdur ki, birini sənə icarəyə versin

."O cavab verdi: "Varı idi

".Həzrət (s) buyurdu: "O sənin qardaşın deyil

İmam Sadiq (ə) buyurdu: "Qazandığın şeylərdən qardaşlarına da ver. Çünki Allah- .۴ (taala buyurub: Yaxşılıqlar pislikləri aradan aparır."(۲)

İmam Sadiq (ə) Rəsulullahdan (s) nəql edib və buyurmuşdur: "Bu ümmətin üç şeyi yerinə yetirməyə qüdrəti çatmır: Din qardaşlarına maddi yardımı, ədaləti

səh:۴۴

---

Məsadiqul-ixvan, səh.۸. Orada deyilir: İmamın (ə) sözü mənə o qədər təəccüblü . [۱] -۱ .gəldi ki, bu mənim üzümdən aşkar görsənirdi

.hud surəsi, ayə ۱۱۴ . [۲] -۲

riayət etməsi və başqalarını özündən üstün tutmağı, hər hansı bir halda Allahı xatırlamaq və bu təkcə "subhanəllah, vəlhəmdu lillah, və la ilahə illəllah, vəllahu əkbər" demək deyil, əksinə, haram bir iş görən zamanı Allahdan qorxub və onu (etməməkdir."(١)

İbn Əyun deyir ki, imam Sadiqdən (ə) müsəlmanın digər müsəlman qardaşının . ۵ qarşısında olan haqqı barəsində sual soruşdum. İmam (ə) cavab vermədi. Ayrılmaq ".istəyəndə o həzrətlə (ə) vidalaşan zaman ərz etdim: "Mənə cavab vermədiniz

Həzrət (ə) buyurdu: "Əgər cavab versəm (və siz də ona əməl etməsəniz) qorxuram kafir olasınız. Şübhəsiz Allahın bəndələrinə vacib etdiyi bu mühüm üç şeydir: ١. Başqalarının haqqında ədalətə riayət etmək və özü üçün bəyənmədiyi şeyləri mömin qardaşı üçün də rəva bilməmək. ٢. Allaha xatir mömin qardaşına maddi yardım etmək. ٣. Hər hansı bir halda Allahı yad etmək və Allahı yad etmək təkcə "subhanəllah vəl-həmdu lillah" demək deyil, əslində Allahın haram etdiyi şeylərdən çəkinməkdən (ibarətdir."(٢)

## Yalançı, nadan və...aid bölmə .۱۵

YALANçı, NADAN Və əMəLI PIS OLAN INSANLA DOSTLUQ eTMəYIN . ۱۵ MəKRUhLUğUNA AID BöLMə

(İmam Sadiq (ə) nəql edir ki, Əmirəlmöminin (ə .١



---

.Məsadiqətul-ixvan, səh.٨ . [١] -١
.Məsadiqətul-ixvan, səh.١٢ . [٢] -٢

minbərə çıxanda buyurardı: "Müsəlman insanların üç dəstəsi ilə dostluq etməsə yaxşıdır: Həyasız günahkarla, nadan və yalançı ilə. Həyasız günahkar şəxs öz işini sənin üçün yaxşı cilvələndirər və çox istəyər ki, sən də onun kimi olasan. O dünya və axirətə aid işlərdə sənə kömək etməz. Ona yaxınlaşmaq zülm və daş qəlbli olmağa .səbəb olar və onunla get-gəl etmək sənin abır-həyanı aparar

Amma nadandan sənə xeyir ümidi olmaz və özünü zəhmətə salsa da belə sənə gələn zərəri qaytara bilməz. Sənə xeyir vermək istəsə də, ancaq zərəri dəyər. Belə isə onun ölməyi qalmağından, sükut etməsi söz deməsindən və uzaqlaşması da yaxın .olmasından daha yaxşıdır

Yalançı ilə yaşamaq yaxşı olmaz. Çünki o səndən başqalarına xəbər aparar və başqalarından da sənə xəbər gətirər, xəbəri qurtaranda isə ortaya başqa söz atar ki, özünü doğru danışan insan kimi qələmə versin, bir haldakı o doğru danışmır. O xalq arasında düşmənçilik yaratmaqla ixtilaf salır və qəlblərdə kin toxumu əkir. Belə isə (Allahdan qorxun və özünüz barəsində fikrləşin."(١

Kuleyni Kafi kitabında imam Sadiqdən (ə) nəql etmişdir ki, Əmirəlmöminin (ə) . ٢ .buyurdu: "Müsəlmanın pis insanla dostluq etməsi yaxşı deyil



---

.Üsuli Kafi, səh.۴۸۰ (məcalisu əhlil-məasi) və səh.۶۱۰; Məsadiqətul-ixvan, səh.۵۲ . [١] -١

Çünki o öz əməlini yaxşı cilvələndirər və çox istəyər ki, başqaları da onun kimi olsunlar. O öz dostuna dünya və axirətə aid işlərdə kömək etməz. Onunla get-gəl etmək abır-həyanın getməsinə və xarlığa səbəb olur."(۱)

۳. İmam Sadiq (ə) buyurdu: "Əməli pis olan, nadan və yalançı adamla dostluq etmək müsəlman şəxsin şənində deyil."(۲)

۴. Zürarə deyir ki, imam Sadiq (ə) buyurdu: "Nadanla dostluq etməkdən pərhiz et. Çünki onun tərəfindən nə qədər şad olsan da, o sənə pislik etməyə daha da yaxın olur. (Onunla dostluq etməkdən hər nə qədər sevinsən də, onun axmaqlığının vasitəsilə sənə zərər vurmaq təhlükəsi daha da yaxındır.)(۳)

۵. İmam Sadiq (ə) deyir ki, həzrət Əli (ə) minbərdə buyurdu: "Yaxşı olar ki, müsəlman yalançı adamla dostluq etməkdən uzaqlaşsın. Çünki o səndən başqalarına və başqalarından da sənə xəbər çatdırıb sənin həyatını acı edir və korlayır. O hər zaman bir xəbər eşidərsə, onu başqa bir xəbərə qoşur ki, özünün düz danışdığını isbat etsin. Halbuki doğru danışmır. Belə ki, düşmənçilik yaratmaq və qəlblərdə kin toxumu əkmək üçün bir dəstədən başqa bir dəstə üçün xəbərlər çatdırır."(۴)



## ۱۶. Bəzi işlərdə günahkar və...aid bölmə

---

۱- [۱]. Üsuli Kafi, səh.۶۰.

۲- [۲]. mucalisətu əhlil-məasi (Üsuli Kafi, səh. ۴۸۰).

۳- [۳]. mən tukrihu mucalisətəhu və murafəqətəhu (Üsuli Kafi, səh.۶۱۱).

۴- [۴]. Məhasin Bərqi, səh.۱۱۷.

## BəZI IşLəRDə GüNAhKAR Və SəVIYYəSIZ şəXSLəRIN IşTIRAK eTMəSINə YOL VeRMəYIN MəKRUhLUğUNA AID BöLMə .۱۶

Əmmar ibn Musa deyir ki, imam Sadiq (ə) buyurdu: "Ey Əmmar! Əgər istəsən İlahi nemətlər sənin üçün həmişə olsun, mürüvvətin kamil, eyibsiz və həyatdakı işlərin qaydasında olsun, gərək qullara və səviyyəsiz şəxslərə öz işin dəxalət etməyə icazə verməyəsən. Çünki əgər onları əmin şəxs kimi bilsən sənə xəyanət edərlər, əgər sənə bir xəbər gətirsələr yalan deyərlər, əgər sənə bir müsibət baş verərsə səni xar edərlər, vədə versələr vədələrinə əməl etməzlər." .۱

Əmmar deyir ki, imam Sadiq (ə) buyurdu: "Yaxşı insanların bir-birlərini sevməsi onlar üçün savab, pislərin yaxşıları sevməsi yaxşılar üçün fəzilət, əməli pis olanların yaxşılarla düşmənçiliyi yaxşılar üçün zinət və iftixar, yaxşıların da pis insanlarla düşmənçiliyi isə pislər üçün zillət və alçaqlıqdır."(۱)

Kafi kitabında nəql olunmuşdur ki, Loğman öz oğluna dedi: "Oğlum! Camaatla çox yaxın əlaqədə olma, bu sənin onların qəlbindən uzaqlaşmağına səbəb olar və onlardan bir dəfəlik ayrılma ki, səni xar və ucuz sayarlar. Hər bir heyvan öz növündən olan heyvanı sevir, insan da həmçinin öz növünü sevəndir. Öz bəyənilən işlərini o işlə müxalif olan insanların yanında demə. Çünki canavarla qoyunun .۲



---

۱-[۱]. mən tukrihu mucalisətəhu və murafiqətəhu) ۶۱۱Üsuli Kafi, səh.).

arasında dostluq olmadığı kimi, yaxşı insanla pis insanın arasında da dostluq olmayacaq. hər kim qıra yaxınlaşarsa, o qırdan bir azı ona yapışmış olar. həmçinin hər kim günahkarla (həyatında) şərik olarsa, onun qaydalarını öyrənər, hər kim dava-dalaşı çox sevərsə, danlanar və töhəmtamiz yerlərə gedən də müttəhim olar, pis yoldaş seçənin adı təmiz qalmaz və dilinin qabağını almayan da peşman olar."(۱)

۳. Əmmar Sabati deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Ey Əmmar! Əgər Allahın nemətnin sənin üçün davamlı olmağını istəyirsənsə, xalqın sənə qarşı olan məhəbbəti artsın və həyatda rahat olasan, gərək qullar və səviyyəsiz şəxslərlə məsləhətləşməyəsən. Çünki əgər onlara etibar etsən sənə xəyanət edərlər, əgər onlar sənə bir xəbər gətirsələr yalan danışarlar, sənə müsibət baş verəndə səni xar edərlər və sənə vədə verərlərsə yalan danışarlar."(۲)

۴. İmam Sadiq (ə) nəql edir ki, atam buyurardı: "haqqa xatir qiyam et, əlindən çıxanlara görə təəssüflənmə, sənə aid olmayan şeylərdən uzaqlaş, düşmənçilikdən pərhiz et, dostlarınla əmin sandıqlarından savayı ehtiyatla rəftar et və əmin o kəsdir ki, Allahdan qorxar. Pis adamla yoldaşlıq etmə, ona sirrini bildirmə, əmanəti ona tapşırma və işlərində Allahdan qorxanlarla məsləhətləş."(۳)



---

۱- [۱] .. Həmin mənbə.

۲- [۲] .. İləluş-şəraye, səh.۱۸۷.

۳- [۳] . Həmin mənbə.

## Yalançı, günahkar, xəsis, nadan,...aid bölmə .۱۷

YALANçı, GüNAhKAR, XəSIS, NADAN, SILeYI-RəhM eTMəYəN (QOHUMLARLA GET-GəL ETMəYəN) Və SAIR şəXSLəRLə YOLDAşLıQ eTMəYIN hARAM OLMASıNA AID BöLMə . ۱۷

İmam Sadiq (ə) öz atasından nəql edir ki, atam Əli ibn Hüseyn (ə) mənə buyurdu: "Ey əziz oğlum! Beş nəfərlə dostluq etmə, danışma və səfərə çıxma." .۱

İmam Baqir (ə) atasından o beş nəfəri tanıtdırmağını istəyir. İmam Səccad (ə) buyurdu: "۱. Yalançı ilə dostluq etməkdən pərhiz et. Çünki yalançı ilğım kimidir. O sənə uzaqı yaxın və yaxını da uzaq göstərər. ۲. Fasiqlə dostluqdan çəkin. Çünki o səni bir qarın yeməyə və ondan da azına satar. ۳. Xəsis insanla dostluq etmə, çünki onun köməyinə çox ehtiyacın olarsa, o (sənə kömək etməz və) səni xar edər. ۴. Qohumlarıyla qırılan və əlaqəni kəsənlə dostluq etmə. Çünki onlar Quranda üç yerdə nifrin olunublar:

a) "Odur ki, sizdən (münafiqlər və imanı zəif olanlardan Allahın fərmanından və Qurandan) üz döndərəcəyiniz təqdirdə yer üzündə fəsad törətmək və qohumluq əlaqələrinizi kəsdikdən sonra yenə də (nicata) ümidiniz vardır?"(۱)

b) "(Allah və Rəsulu ilə) əhd-peyman bağladıqdan sonra onu pozan və həmçinin Allahın birləşməsinə əmr etdiyi şeyi qıran və yer üzündə fitnə-fəsad törədən kəslər üçün lənət vardır və onların yeri cəhənnəm odudur."(۲)



---

۱- [۱] . Məhəmməd surəsi, ayə ۴۷.

۲- [۲] . Rəd surəsi, ayə ۲۵.

v) Bəqərə surəsində buyurmuşdur: "həmin kəslər ki, Allahla əhd-peyman bağladıqdan sonra onu pozur, Allahın birləşdirilməsini əmr etdiyi şeyləri kəsir və yer üzündə fitnə-fəsad törədirlər, ziyana uğrayanlar da onlardır."(١)

٢. İmam Sadiq (ə) buyurdu: "Nadanla dostluq etmə. Çünki ona nə qədər yaxınlaşırsansa pisliyə yaxınlaşmış olursan (və ondan sənə pislikdən savayı bir şey çatmaz).(٢)

٣. Seyid Rəzi "Nəhcül-bəlağə"də deyir ki, möminlərin rəhbəri Əli (ə) buyurdu: "Oğlum! Nadanla dostluq etmə. O sənə xeyir vermək istəyənda zərər vurar. Xəsislə dostluqdan çəkin. Çünki şiddətli ehtiyacın olanda səni tərk edər. Əməli pis olan insanla dostluq etmə. Çünki səni ucuz və dəyərsiz bir şeyə satar. Yalançı ilə dostluq etmə. Çünki o ilğım kimidir, uzağı sənə yaxın edər və yaxını da səndən uzaqlaşdırar."(٣)

٤. İmam Məhəmməd Baqir (ə) buyurdu: "Dörd şəxsə yaxınlaşma və onlarla dostluq etmə; nadan, xəsis, qorxaq və yalançı. Nadan şəxs sənə yaxşılıq etmək istəyəndə zərər vurar, xəsis səndən bir şey alar, ancaq sənə bir şey verməz, qorxaq səndən və öz ata-anasından qaçar, yalançı isə doğru danışanda heç kim onun sözünü təsdiq etməz."(٤)



---

١-[١]. Bəqərə surəsi, ayə ٢٧.

٢-[٢]. Məcalis, Səduq səh.٢٤.

٣-[٣]. Xisal, Səduq səh.١١۶.

٤-[٤]. Məcalis, Səduq səh.٣٥.

۵. İmam Cəfər Sadiq (ə) atasında nəql edir ki, imam Baqir (ə) buyurdu: "Mən səfərə çıxmaq istəyirdim, atam Əli ibn Hüseyn (ə) mənə tövsiyələrini buyurdu: Oğlum! Axmaq adamla əlaqə qurma, dostluq və yoldaşlıq etmə. Çünki axmaq adam sənin yanında və sən olmayanda da eyb axtarmaq dalınca olar. O əgər bir söz danışmaq istəsə, nadanlığı onu rüsvay edər, sükut edəndə danışığındakı acizliyi onu kiçildər, bir iş görəndə onu xarab edər, öhdəsinə götürdüyü məsuliyyəti korlayar, onun öz elmi ehtiyacını ödəməz və başqalarının da elmi ona fayda verməz, nəsihət verənlərin nəsihətini qəbul etməz, dostu onun əlindən rahat olmaz, anası çox istəyər ona əza saxlasın, həyat yoldaşı onu itirmək istəyər, qonşusu ondan uzaq olmağı istəyər, dostu təkliyi onunla oturub-durmaqdan üstün tutar, əgər bir məclisdə başqalarından kiçikdirsə digərləri onun əlindən əziyyət çəkərlər və əgər başqalarından böyük olarsa, onları fəsada tərəf çəkib aparar."(۱)

### ۱۸. Səviyyəsiz, sərvətli insanlarla...aid bölmə

۱۸. SəVIYYəSIZ, SəRVəTLI INSANLARLA YOLDAşLığıN Və QADıNLARLA SöhBəTIN MəKRUhLUğUNA AID BöLMə

۱. İmam Cəfər Sadiq (ə) öz babalarından nəql edir ki, Rəsulullah (s) buyurdu: "Üç növ insanla



---

۱- [۱]. Həmin mənbə.

yoldaşlıq insanın qəlbini öldürür: ١. Səviyyəsiz insanlarla, ٢. Qadınlarla danışmaq, ٣. Sərvət sahibləri ilə yoldaşlıq etmək."(١)

٢. İmam Məhəmməd Baqir (ə) bir şəxsə buyurdu: "Varlı insanlarla dostluq etmə. Çünki insan onlarla əlaqə quranda Allaha verdiyi nemətə görə təşəkkür etməz və o elə bir səviyyəyə çatar ki, düşünər Allah ona heç bir nemət verməmişdir."(٢)

## ١٩. Töhmətamiz məkanlara daxil olmağın məkruhluğuna aid bölmə

١. İmam Cəfər Sadiq (ə) deyir ki, əmirəlmöminin Əli (ə) buyurdu: "hər kim özünü töhmət qarşısında qoyarsa, gərə ona bədgüman (onun barəsində pis fikrləşənlərə) olanlara narahat olmasın və hər kəs öz sirrini gizli saxlasa ixtiyarı öz əlində olar (sirri açılmaz)."(٣)

٢. İmam Sadiq (ə) buyurdu: "hər kim töhmətə layiq olan yerlərə getsə və müttəhim olunsa, gərək özünü danlasın."(٤)

٣. İmam Baqir (ə) öz atasından nəql edir ki, həzrət Əli (ə) buyurdu: "hər kim özünü töhmət qarşısında qoysa, gərək ona bədgüman olanları qınamasın."(٥)



---

١- [١]. mən tukrihu mucalisətəhu və murafiqətəhu) Üsuli Kafi, səh.٦١١).

٢- [٢]. Məcalis, Səduq səh.١٥٣.

٣- [٣]. Rövzeyi Kafi, səh.١٥٢.

٤- [٤]. Məcalis, Səduq səh.٢٩٧.

٥- [٥]. Məcalis, Səduq səh.١٨٢.

۴. həzrət Əli (ə) oğlu imam Həsənə (ə) etdiyi vəsiyyətində buyurdu: "Töhmətə layiq olan məkanlardan və camaat haqqında pis fikirləşdiyin yerlərdən uzaqlaş. Çünki pis yoldaş insanı aldadar."(۱)

۵. İmam Musa Kazım (ə) deyir ki, imam Sadiq (ə) buyurdu: "Şübhəli (və töhmətə layiq) yerlərdən uzaq olun və hətta insan gərək anası ilə də yol getməsin. Çünki camaatın hamısı bilmir ki, bu qadın onun anasıdır."(۲)

۶. Seyid Rəzi "Nəhcül-bəlağə"də əmirəlmöminindən (ə) nəql edir ki, həzrət (ə) buyurdu: "Özünü töhmət qarşısında qoyan kəs, onun haqqında pis güman edənləri gərək qınamasın."(۳)

۷. həmçinin o həzrət (ə) buyurub: "Xalqın üzünə zülm və təcavüz qılıncını çəkən kəs həmin qılıncla öldürülər, hiylə və kələk gələn həlak olar, qorxmamazlıq göstərən qərq olar və töhmətə layiq olan yerlərə gedənə ittiham vurular."(۴)

## ۲۰. Möminin zirəkliyindən qorxmağa...aid bölmə

۲۰. MöMININ ZIRəKLIYINDəN QORXMAğA Və PəRhIZ eTMəYIN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Baqir (ə) Allahın buyurduğu "Şübhəsiz, bunda (bu hadisədə) ağıl və şüur sahibləri üçün (Allahın qüdrət və qəzəbi, bəndənin azğınlığının sonu barəsində) nişanələr vardır"(۵) ayənin təfsirində buyurdu: "Burada



---

۱- [۱]. Məcalis, Şeyx Tusinin oğlu, səh.۵

۲- [۲]. Sərair, səh.۴۷۰.

۳- [۳]. Nəhcül-bəlağə, ikinci hissə, səh.۱۸۴.

۴- [۴]. Nəhcül-bəlağə, ikinci hissə, səh.۲۲۷.

۵- [۵]. hicr surəsi, ayə ۷۵.

mutəvəssimin" (şüur sahibləri) kəlməsindən məqsəd məsum imamlardırlar (ə)." (Çünki) Allahın Rəsulu (s) buyurub: Möminin zirəkliyindən çəkinin. Çünki o danışığında (İlahinin nurundan faydalanır."(۱

Süleyman ibn Cəfər deyir ki, biz bir neçə nəfərlə imam Musa Kazımın (ə) yanında idik. .۲ O həzrət (ə) buyurdu: "Möminin zirəkliyindən qorxun. Çünki o bütün işlərə İlahinin nuru (vasitəsilə baxır."(۲

Seyid Rəzi "Nəhcül-bəlağə"də deyir ki, Əli (ə) buyurdu: "Möminlərin sizə etdikləri .۳ (gümandan çəkinin. Çünki Allah haqqı onların dili ilə cari edir."(۳

**Düşüncə sahibləri ilə məsləhət etməyin müstəhəbliyinə aid bölmə .۲۱**

İmam Sadiq (ə) atasından nəql edir ki, Peyğəmbərdən (s) soruşdular: "Ey Allahın .۱ "?Rəsulu! Ağıllı olmaq və uzaqgörənlik nədədir

həzrət (s) buyurdu: "Düşüncə sahibləri ilə məsləhətləşmək və onlara itaət (etməkdə."(۴

İmam Sadiq (ə) deyir ki, Rəsulullah (s) həzrət Əliyə (ə) etdiyi vəsiyyətində buyurdu: .۲ "Məsləhətləşməkdən daha möhkəm arxa və kömək



---

.Sərair, səh.۴۷۰ . [۱] -۱
.Bəsairud-dərəcat . [۲] -۲
.Nəhcül-bəlağə, ikinci hissə, səh.۲۱۹ . [۳] -۳
.Bəsairud-dərəcat . [۴] -۴

olmaz, tədbir və çarə düşünməkdən də daha yaxşı ağıl yoxdur."(۱)

۳. İmam Baqir (ə) buyurdu: "Tövratda dörd cümlə yazılmışdır: ۱. hər kim məsləhətləşməsə peşman olar, ۲. Fəqr və yoxsulluq ən böyük ölümdür, ۳. Necə rəftar etsən səninlə də elə rəftar edəcəklər, ۴. hər kim bir şeyə malik olarsa, öz mənfəətini başqalarının mənfəətindən üstün tutar."(۲)

۴. İmam Sadiq (ə) buyurdu: "İnsan heç vaxt məsləhətləşməklə həlak olmaz."(۳)

۵. Seyid Rəzi "Nəhcül-bəlağə"də nəql edir ki, həzrət Əli (ə) buyurdu: "Ağıl kimi sərvət, nadanlıq kimi yoxsulluq, ədəb kimi irs, məsləhətləşmək kimi arxa və kömək olmaz."(۴)

۶. O həzrət (ə) buyurubdur: "hər kəs öz rəyinə əməl etsə (yəni öz ağlı ilə oturub-dursa), nabüd olar və hər kim böyük şəxslərlə məsləhətləşərsə, o, onların ağılına da şərikdir."(۵)

۷. O həzrət (ə) buyurdu: "Məsləhətləşmək çıxış yoludur."(۶)

۸. O həzrət (ə) həmçinin buyurdu: "hər kəs öz rəyi və fikri ilə kifayətlənərsə, özünü təhlükəyə atmışdır."(۷)



---

۱-[۱]. Məhasin Bərqi, səh.۶۰۱.

۲-[۲]. Həmin mənbə.

۳-[۳]. Həmin mənbə.

۴-[۴]. Nəhcül-bəlağə, ikinci hissə.

۵-[۵]. Həmin mənbə.

۶-[۶]. Həmin mənbə.

۷-[۷]. Həmin mənbə.

## AğıLLı PəRhIZKARLA MəSLəhəTLəşMəYIN, ONA ITAəT eTMəYIN MüSTəhəBLIYINə Və ONUNLA MüXALIFəT eTMəYIN MəKRUhLUğUNA AID BöLMə .۲۲

۱. İmam Cəfər Sadiq (ə) buyurdu: "hər kimin batinində nəsihət edən, daxilində çəkindirən, doğru yol göstərən qüvvə və dostu olmasa düşməni özünə qalib etmişdir."(۱)

۲. İmam hadi (ə) öz atalarından nəql etmişdir ki, həzrət Əli (ə) buyurdu: "hər kim öz rəyi və fikri ilə kifayətlənərsə, özünü təhlükəyə atmışdır."(۲)

۳. İmam Sadiq (ə) buyurdu: "Öz işlərində Allahdan qorxanlarla məsləhətləş."(۳)

۴. İmam Sadiq (ə) nəql edir ki, həzrət Əli (ə) buyurdu: "Sənin qarşına çıxan işlər barəsində Allahdan qorxanlarla məsləhətləş."(۴)

۵. Süleyman ibn Xalid deyir ki, imam Cəfər Sadiq (ə) buyurdu: "Təqvalı olan ağıllı insanlarla məsləhətləş. Çünki onlar yaxşılıqdan savayı başqa şeyə tərəf yol göstərməzlər və onlarla müxalifət etməkdən çəkin. Çünki ağıllı pərhizkarla müxalifət etmək din və dünyanın aradan getməsinə səbəb olur."(۵)

۶. İmam Sadiq (ə) Rəsulullahdan (s) nəql edir ki, həzrət (s) buyurdu: "Nəsihət verən ağıllı şəxslə



---

۱- [۱]. Məcalis, Səduq səh.۲۶۵.

۲- [۲]. Məcalis, Səduq səh.۲۸۶.

۳- [۳]. Məhasin Bərqi, səh.۶۰۱.

۴- [۴]. Həmin mənbə.

۵- [۵]. Həmin mənbə.

məsləhətləşmək Allah tərəfindən inkişafa, bərəkətə və müvəffəqiyyətə səbəbdir. Əgər ürəyiyanan ağıllı bir şəxs sənə doğru yol göstərərsə, onunla müxalifətçilik etməkdən çəkin. Çünki bu müxaliflik həlakətə səbəb olar."(١)

٧. İmam Cəfər Sadiq (ə) buyurdu: "Sizin üçün özünüzün həll etməyə qüdrətiniz çatmadığı mühüm bir iş qabağa çıxanda, niyə ağıllı dindar və pərhizkarla məsləhətləşmirsiniz?"

İmam Sadiq (ə) daha sonra buyurdu: "Bilin! hər kim bu işi yerinə yetirərsə, Allah onu xar etməz, əksinə onun məqamını ucaldar, ən yaxşı əmələ və onların Allaha daha yaxın olanına tərəf doğru yol göstərər."(٢)

٨. İmam Sadiq (ə) buyurdu: "Məsləhət bir neçə şərtdən ibarətdir. Əgər onlar tanınmasa və riayət olunmasa məsləhətləşən kəs üçün zərəri xeyrindən çox olacaq.

O şərtlər məsləhət olunan kəsdən asılıdır: ١. Aqil olsun. ٢. Müstəqil və azad fikirli olsun. ٣. Mehriban dost və qardaş kimi olsun. ۴. Əgər sənin sirrindən agah olsa, sənin özün kimi o sirri gizli saxlayan olsun. Çünki, sən o zaman məsləhət verən şəxsin məsləhətindən faydalana bilərsən ki, o, aqil olmuş olsun. Əgər o, azad fikrli dindar şəxs olarsa, sənə nəsihət vermək üçün imkanı olana qədər çalışar. Elə ki, o mehriban dost və qardaş



---

١-[١]. Məhasin Bərqi, səh.۶٠٢.

٢-[٢]. Həmin mənbə.

kimi olsa, onu öz sirrindən agah edəndə o sənin sirrini qoruyub saxlayacaq və onun sənin sirrindən olan agahlığı, sənin o sirrdən olan agahlığın kimi olacaq və (əgər bu şərtlərə riayət olunsa) bu məsləhət faydalı və nəsihət də kamil olar."(۱)

### ۲۳. Məsləhət istəyənə doğru yol göstərməyin vacib olmasına aid bölmə

۱. İmam Cəfər Sadiq (ə) buyurdu: "Bir nəfər Əmirəlmömininin (ə) yanına gəldi və ərz etdi: Mən məsləhətləşmək üçün sizin hüzurunuza gəlmişəm. (Sizin iki övladınız) Həsən (ə), Hüseyn (ə) və Abdullah ibn Cəfər qızım üçün elçiliyə gəliblər. (Yəni onların hansılarını qəbul edim?)"

Həzrət Əli (ə) buyurdu: "Hansı onunla məsləhətləşirsə, o daha etibarlıdır. ..."(۲)

۲. İmam Sadiq (ə) buyurdu: "Hər kim mömin qardaşı ilə məsləhətləşərsə və o, öz xalis nəzərini açıq-aydın bildirməsə, Allah Əzzəvəcəl fikir və düşüncə qüdrətini ondan alar."(۳)

### ۲۴. Aşağı mərtəbəli insanla məsləhətləşməyin caiz olmasına aid bölmə

۱. Muəmmər ibn Xəllad deyir ki, imam Rizanın (ə) qulamlarından Səd adlı birisi vəfat etdi. İmam (ə)



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. Məhasin Bərqi, səh.۶۰۱.

۳- [۳]. Məhasin Bərqi, səh.۶۰۲.

".Muəmmərə buyurdu: "Mənə əmanətçil və fəzilətli bir şəxs tanıtdır

"!?Mən cavabında dedim: "Mən tanıtdırım

Həzrət (ə) qəzəbli bir şəxs kimi buyurdu: "Allahın peyğəmbəri (s) öz dostları ilə ".məsləhətləşərdi və sonra istədiyi şeyin barəsində qərar qəbul edərdi

Fuzeyl ibn Yəsar deyir ki, imam Sadiq (ə) bir iş barəsində mənimlə məsləhətləşdi. .٢ Mən imama (ə) dedim: "Allah sizə kömək olsun! Mənim kimi adam sizə məsləhət verən "?olsun

(İmam (ə) buyurdu: "Bəli, mən hər zaman səninlə məsləhətləşərəm."(١

Həsən ibn Cəhm deyir ki, biz bir dəstə adamla imam Rizanın (ə) xidmətində idik. O .٣ atasını xatırladı və buyurdu: "Heç bir ağıl onun ağlının tayı-bərabəri olmazdı və eyni halda çox zaman özünün qara dərili qulamlarından biri ilə məsləhətləşərdi. O həzrətə ?(ə) dedilər: Sən bununla məsləhətləşirsən

Həzrət (ə) cavabında buyurdu: Mümkündür Allah-taala çətinliyi belə bir şəxsin dili .vasitəsilə aradan qaldırsın

Çox zaman əkin sahəsi, ya da bağ barəsində o həzrətə (ə) məsləhət verərdilər və o (həzrət (ə) də buna əməl edərdi."(٢

səh:٦٠

---

.Məhasin Bərqi, səh.٦٠١ . [١]-١

.Məhasin Bərqi, səh.٦٠٢ . [٢]-٢

۴. Seyid Rəzi "Nəhcül-bəlağə"də həzrət Əlidən (ə) nəql etmişdir ki, Abdulla ibn Abbas məsləhətçi kimi öz nəzərini imam Əliyə (ə) bəyan etdi. Amma imam (ə) onun əqidəsi ilə razı deyildi. Həzrət (ə) buyurdu: "Sən gərək bir məsləhət kimi öz nəzərini mənə bildirəsən. Ancaq sənin nəzərinin əksinə olaraq qərara gəlsəm, gərək mənim nəzərimi qəbul edəsən."(۱)

۵. Əli ibn Məhziyar deyir: "İmam Cavad (ə) mənə yazdı ki, filankəsə de mənimlə məsləhətləşsin və məsləhətdən sonra öz nəzərini seçsin. Çünki, o öz məntəqəsində (Əhvazda) olub keçənlərdən və hakimlərlə necə rəftar etməkdən daha da agahdır. Məsləhətləşmək bərəkətə və xoşbəxtliyə səbəb olur. Allah Quranda peyğəmbərinə (s) buyurur: "İşlərdə onlarla məsləhətləş və qəti qərara gəldikdən sonra Allaha təvəkkül edib yerinə yetir ki, şübhəsiz, Allah təvəkkül edənləri sevir."(۲)

Sonra həzrət (ə) buyurdu: (Baş verənləri mənə xəbər versin, mən də onun üçün ən yaxşı məsləhəti yazaram. Əgər mənim nəzər və fikrlərim yaxşı olmasa, ümidvaram ki, onu açıq-aydın haqq yoluna yönəltmiş olum inşaallah."

Burada "işlərdə onlarla məsləhətləş" cümləsindən məqsəd camaatdan xeyir tələb etməkdir."(۳)



---

۱- [۱]. Nəhcül-bəlağə, ikinci hissə, səh.۲۲۱.

۲- [۲]. Ali İmran surəsi, ayə ۱۵۹.

۳- [۳]. Təfsir Əyyaşi. Əli ibn Məhziyar imam Cavadın (ə) və imam Hadinin (ə) əshabından və Əhvaz şəhərinin sakini idi. O imamla (ə) məktublaşardı.

## Qadınlarla məsləhətləşməyin məkruhluğuna...aid bölmə .۲۵

QADıNLARLA MəSLəhəTLəşMəYIN MəKRUhLUğUNA Və KIşILəRLə . ۲۵ MəSLəhəTLəşMəYIN YAXşı Və FAYDALı OLMASıNA AID BöLMə

İmam Cəfər Sadiq (ə) atalarından nəql edir ki, peyğəmbər (s) həzrət Əliyə (ə) olan .۱ vəsiyyətində buyurdu: "Ya Əli! Qadınlar üçün cümə namazı, hökm çıxarmaq .məsuliyyəti yoxdur və onlarla məsləhətləşmək olmaz

Ya Əli! Tünd əxlaqlı olmaq xoşagəlməzdir və qadınlara itaət etmək peşmançılığa səbəbdir. Ya Əli! Bəyənilməyən şeylərdən də biri qadınların dilidir (yəni İslamın ədəb-(ərkanına riayət etməyən qadınlara aiddir)."(۱)

Əmirəlmöminin (ə) oğlu Məhəmməd hənəfiyyə olan vəsiyyətində buyurmuşdur: . ۲ "Kişilərin nəzərlərini öyrən, sonra haqqa daha yaxın olan fikri seç və şəkk elədiyin " . . .nəzəri kənara qoy

Sonra həzrət (ə) buyurdu: "hər kim öz nəzərinə əməl edərsə, özünü təhlükəyə atır və (hər kəs müxtəlif nəzərləri araşdırarsa, səhv və təhlükəli yolları tanıyar."(۲)

## Qorxaq, xəsis, tamahkar, qul, səviyyəsiz və...aid bölmə .۲۶

QORXAQ, XəSIS, TAMAhKAR, QUL, SəVIYYəSIZ Və əXLAQSıZ şəXSLə . ۲۶ MəSLəhəTLəşMəYIN MəKRUhLUğUNA AID BöLMə

İmam Riza (ə) atalarından, onlar da Əlidən (ə) nəql edir ki, peyğəmbər (s) . ۱ buyurubdur: "Ya Əli! Qorxaq



---

.Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۳۳۸" . [۱] -۱

.Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۳۴۵ və ۳۴۶" . [۲] -۲

şəxslə məsləhətləşmə. Çünki, o, (giriftarçılıqdan) çıxış yolunu sənə çətinləşdirər. Xəsis şəxslə heç məsləhətləşmə. Çünki, o, səni məqsədindən saxlayar. Tamahkarla məsləhətləşmə. Çünki, o, pis əməli yaxşı cilvələndirər. Bil ki, qorxaqlıq, xəsislik və tamahkarlıq elə bir xasiyyətdir ki, pis güman etməkdən yaranır."[1]

۲. Əmmar Sabati deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Ey Əmmar! Əgər istəsən Allahın neməti sənin üçün davamlı olsun, kamil bir kişi olasan və həyatın düzəlsin, öz işlərində qullarla və səviyyəsiz şəxslərlə məsləhətləşmə. Çünki əgər sən onlara etibar etsən, sənə xəyanət edərlər, əgər onlar sənə bir xəbər gətirsələr yalan deyərlər, giriftar olsan səni xar edərlər, sənə vədə verərlərsə vəfa etməzlər."[2]

۳. İmam Cəfər Sadiq (ə) deyir ki, atam buyurardı: "haqqı bərpa et, itirdiklərin üçün təəssüflənmə, sənə aid olmayanlardan kənar ol, düşməndən uzaqlaş, öz dostundan həzərdə ol (yəni onunla ehtiyatla rəftar et), əmin adamlarla əlaqə yarat və dostluq et və əmin şəxs Allahdan qorxandır. Əməli pis adamla dostluq etmə, onu öz sirrindən agah etmə, öz əmanətini ona tapşırma və işlərində Allahdan qorxanlarla məsləhət et."[3]

səh:۶۳

---

۱- [۱]. "Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۳۵۶; Xisal, Şeyx Səduq, ۱-ci cild, səh.۵۰; İləluş-şəraye, səh.۱۷۸.

۲- [۲]. İləluş-şəraye, səh.۱۸۷.

۳- [۳]. İləluş-şəraye, səh.۱۸۷.

## Bidət əhli ilə dostluq etmək və...aid bölmə .۲۷

BIDəT əhLI ILə DOSTLUQ eTMəK Və əLAQəDə OLMAğıN hARAMLığıNA AID BöLMə .۲۷

۱. İmam Sadiq (ə) buyurdu: "Dində bidət yaradanlarla dostluq etmə və əlaqə qurma. Çünki xalqın nəzərində onlardan biri hesab olunarsınız."(۱)

Peyğəmbər (s) buyurdu: "İnsan öz din dostu və oturub-durduğu adamla tanınar."

## Salam verməyin və dostluq etməyin caiz olmadığı kəslərə aid bölmə .۲۸

۱. İmam Sadiq (ə) atalarından nəql edir ki, həzrət Rəsulullahın (s) imam Əliyə (ə) olan vəsiyyətində buyurulur: "Ya Əli! Din və dünyasından azuqə götürməyən kimsəylə dostluq etməkdən sənə heç bir xeyri olmaz. Sənin istəyini yerinə yetirməyən kimsənin, sən də həmçinin istəyini yerinə yetirmə. Çünki o hörmətə layiq deyil."(۲)

۲. İmam Sadiq (ə) atalarından nəql edir ki, peyğəmbər (s) "mənhiyyat" (nəhyə aid) hədisində buyurub: "Cüzam xəstəliyinə tutulmuş adamla bir ziradan (təqribən yarım metrdən) az fasilə ilə danışmaq məkruhdur."

O həzrət (s) buyurdu: "Cüzam tutmuş adamdan şirdən qaçdığın kimi qaç."(۳)



---

۱- [۱]. Üsuli Kafi, səh.۴۷۹ və ۶۱۲.

۲- [۲]. "Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۳۳۴.

۳- [۳]. Xisal, Səduq ۱-ci cild, səh.۱۱۲.

۳. Şeyx Səduq "Xisal" kitabında nəql edir ki, Əmirəlmöminin (ə) buyurdu: "Peyğəmbər (s) camaatı dörd nəfərə salam verməkdən nəhy edibdir: ۱. Məst halında badə qaldırana. ۲. Mücəssəmə düzəldənə. ۳. Nərd oynayana. ۴. Duzbaza (bu ərəblər arasında bir oyun növüdür). Mən bura beşinci bir adamı da əlavə edirəm və sizi şahmat oynayana salam verməkdən nəhy edirəm."(۱)

۴. Rəsulullah (s) buyurdu: "Beş dəstədən hər hansı bir halda gərək uzaqlaşasan: Cüzam tutandan, xoralıdan, dəlidən, zinazadədən və çöldə-biyabanda yaşayan ərəbdən."(۲)

۵. İmam Cəfər Sadiq (ə) atalarından nəql edir ki, altı dəstəyə gərək salam verməyəsən: Yəhudiyə, xaçpərəstə, tualetdə olan şəxsə, spirtli içki olan süfrədə oturana, pak qadınlara töhmət vuran şairə, analara söyüş demək vasitəsilə zarafat edənə.(۳)

۶. həzrət Əli (ə) bir hədisdə buyurur: "Altı nəfərə salam vermək olmaz: ۱. Yəhudi və xarçpərəstə. ۲. Şahmat və nərd oynayana. ۳. Badə götürənə. ۴. Çalğı alətlərindən istifadə edənə. ۵. Bəzi şəxslərin analarına söyüş söymək vasitəsilə zarafat edən kəsə. ۶. Şairlərə (saray şairlərinə)."(۴)

۷. İmam Cəfər Sadiq (ə) atası imam

səh:۶۵

---

۱- [۱]. Xisal, Səduq ۱-ci cild, səh.۱۱۲.

۲- [۲]. Xisal, Səduq ۱-ci cild, səh.۱۳۸.

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Xisal, Səduq ۱-ci cild, səh.۱۶۰; Sərair səh.۴۸۴.

Məhəmməd Baqirdən (ə) nəql edir ki, o buyurdu: "Yəhudiyə, xaçpərəst və zərdüştə, bütpərəstə, badə qaldırana, şahmat və nərd oynayanlara, qadın sifət kişiyə (özünü digər kişilərin ixtiyarında qoyan kişiyə), pak qadınlara töhmət vuran şairə və namaz halında olana salam verməyin. Çünki namaz qılan salamın cavabını verə bilmir. Hərçənd salam vermək müsəlman üçün müstəhəb bir əməl və onun cavabı isə vacib bir əməldir. Sələm alana, tualetdə olana, hamamda olana və aşkarda hər hansı bir günahı edən fasiq şəxsə salam verməyin."(۱)

## ۲۹. Camaata olan dostluq və məhəbbəti izhar etməyin müstəhəbliyinə aid bölmə

۱. İmam Məhəmməd Baqir (ə) buyurdu: "Bəni Təmim tayfasından olan bir səhra ərəbi peyğəmbərin (s) yanına gəldi və ərz etdi: "Mənə nəsihət verin".

Peyğəmbərin (s) ona buyurduğu nəsihətlərdən də biri belə idi: "Camaata qarşı olan məhəbbətini izhar et ki, səni də sevsinlər."(۲)

۲. İmam Musa Kazım (ə) buyurdu: "Camaata olan dostluq və məhəbbəti izhar etmək ağılın yarısıdır."(۳)

۳. İbn İdris buna oxşar hədisi "Sərair" kitabında belə bir fərqlə nəql etmişdir: "Başqaları ilə mülayim rəftar

səh:۶۶

---

۱- [۱]. Xisal, Səduq ۲-ci cild, səh.۸۲.

۲- [۲]. Ət-təhəbbubu ilən-nasi") Üsuli Kafi, səh.۶۱۲").

۳- [۳]. Həmin mənbə.

etmək (mehriban olmaq) yaşayış vasitəsinin yarısıdır və hər kim orta həddi gözləsə (yoxsul olmaz."(١)

٤. İmam Sadiq (ə) nəql edir ki, imam Həsən Müctəba (ə) buyurubdur: "Qohum odur ki, hərçənd nəsəb cəhətindən uzaq olsa da belə, dostluq cəhətindən insana daha yaxın olsun və özgə də odur ki, nəsəb cəhətindən yaxın olsa da belə, məhəbbət və dostluq cəhətindən insana yad və özgə kimi olsun. İnsanın əlinin bədəninə yaxın olduğu kimi heç bir şey, digər bir şeyə yaxın deyil. Əl xəyanət edir, kəsilir və kəsiləndən sonra sağalır. (Yəni etibarlı olmaq qohumun yaxın olması ilə deyil, əgər o dost deyilsə də belə. Bəzən qohum əməldə insandan uzaq və özgə olur. Yaxud məqsəd budur ki, oğrunun əli sahibinə xəyanət edir və yaxın olmasına baxmayaraq da kəsilir, ya da insan özü öz əlinin düşmənidir və onun kəsilməsinə səbəb olur, ya da ki, cismi yaxınlığa (etimad yoxdur. həqiqi və əbədi xeyir isə mənəvi cəhətdən yaxın olmaqdır.)"(٢)

٥. İmam Sadiq (ə) Rəsulullahdan (s) nəql edir: "Camaata olan dostluğu (məhəbbəti) (izhar etmək ağılın yarısıdır."(٣)



---

١- [١] . Sərair, səh.٤٦٤.

٢- [٢] . Ət-təhəbbubu ilən-nasi vət-təvəddudu iləyhim) Üsuli Kafi, səh.٦١٢).

٣- [٣] . Həmin mənbə.

## Xalqla yaxşı rəftar etmək, gülərüz olmaq...aid bölmə .۳۰

XALQLA YAXşı RəFTAR eTMəK, GüLəRüZ OLMAQ, ehTIRAM eTMəK Və ONLARA .۳۰ NARAhATçıLıQ YARATMAQDAN çəKINMəYIN MüSTəhəBLIYINə AID BöLMə

(İmam Sadiq (ə) buyurdu: "Xalqla gülərüz olmaq ağılın üçdə biridir."(۱ .۱

İmam Sadiq (ə) peyğəmbərdən (s) nəql edir ki, həzrət (s) buyurdu: "Üç şey insanın .۲ müsəlman qardaşı ilə olan dostluğunu möhkəmləndirir: ۱. Gülər üzlə onunla görüşsün. (۲. Məclisdə ona yer versin. ۳. Onu ən yaxşı adlarla çağırsın."(۲

Һuzeyfə ibn Mənsur deyir ki, imam Sadiq (ə) buyurdu: "hər kim camaatı incitməkdən .۳ əl çəksə, hərçənd ki, o tək özü bu işdən əl çəkib, lakin bunun müqabilində bir çox (insanlar onu incitməkdən əl çəkərlər."(۳

## İnsanın möminə olan məhəbbətini...aid bölmə .۳۱

İNSANıN MöMINə OLAN MəhəBBəTINI BILDIRMəYIN MüSTəhəBLIYINə AID . ۳۱ BöLMə

İmam Sadiq (ə) buyurdu: "Əgər bir kəsi çox sevərsənsə onu bu işdən agah et. Çünki .۱ (bu sizin aranızda olan məhəbbətin möhkəmlənməsinə səbəb olar."(۴

Nəsr ibn Qabus deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Əgər qardaşlarından birini .۲ :çox istəsən onu bu məhəbbətindən agah et, necə ki, həzrət İbrahim (ə) dedi



---

.(Üsuli Kafi, səh.۶۱۲ (Ət-təhəbbubu ilən-nasi . [۱] -۱

.Həmin mənbə . [۲] -۲

.Həmin mənbə . [۳] -۳

.(Üsuli Kafi, səh.۶۱۲ (Əxbarur-rəculi əxahu bi hubbih . [۴] -۴

".Ey Rəbbim, ölüləri necə diriltməyini mənə göstər"

"?Allah-taala buyurdu: "Məgər (ölülərin dirilməsinə) imanın yoxdur

(İbrahim dedi: "İmanım var! Lakin qəlbimin rahatlıq tapması üçün istədim."(۱) (۲

".Bir nəfər imam Baqirə (ə) ərz etdi: "Mən bu kişini çox sevirəm .۳

İmam (ə) ona buyurdu: "Onu bu işdən xəbərdar et. Çünki bu dostluğu möhkəmlədirir (və mehribançılığı artırır."(۳

(İmam Cəfər Sadiq (ə) buyurdu: "Hər kimi çox sevsən bunu ona de."(۴ .۴

İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Əgər sizlərdən biri dostunu, ya .۵ (mömin qardaşını çox istəyərsə, onu bu işdən agah etsin."(۵

## Sözü salamla başlamağın və...aid bölmə .۳۲

SöZü SALAMLA BAşLAMAğıN Və SALAMDAN DA QABAQ CAVAB VeRMəMəYIN . ۳۲ MüSTəhəBLIYINə AID BöLMə

İmam Sadiq (ə) buyurdu: "Salamı başlayan kəs, Allaha və onun Rəsuluna (s) daha .۱ (yaxındır."(۶

Əli ibn Hüseyn (ə) buyurdu: "Gücü çatdığı qədər infaq etmək, qüdrəti çatdəğə qədər .۲ ailəsinə geniş imkan yaratmaq, camaatla ədalətli, insafla



---

.Bəqərə surəsi, ayə ۲۶۱ . [۱] -۱

.(Üsuli Kafi, səh.۶۱۲ (Əxbarur-rəculi əxahu bi hubbih . [۲] -۲

.Məhasin Bərqi, səh.۲۶۶ . [۳] -۳

.Həmin mənbə . [۴] -۴

.Həmin mənbə . [۵] -۵

.(Üsuli Kafi, səh.۶۱۲ (Babut-təslim . [۶] -۶

rəftar etmək və (söhbətə) onlara salam verməklə başlamaq möminin əlamətlərindən sayılır."(1)

3. İmam Cəfər Sadiq (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Allahın və Onun Rəsulunun (s) yanında ən yaxşı adam salamı başlayan kəsdir."(2)

4. Həmin sənədlə nəql olunubdur ki, Rəsulullah (s) buyurdu: "hər kim salamdan qabaq danışmağa başlasa ona cavab verməyin."

Həmçinin o həzrət (s) buyurub: "Danışmazdan qabaq salam verin. Əgər hər kim salamdan qabaq danışarsa, ona cavab verməyin."(3)

5. İmam Sadiq (ə) buyurdu: "Bir mələk qapının ağzında dayanan bir kişini gördü. Mələk ona dedi: Niyə bu qapının yanında dayanmısan?

O cavab verdi: Qardaşlarımdan biri bu evdədir və mən istəyirəm ona salam verim.

Mələk ona dedi: Sizinlə onun arasında qohumluq əlaqəsi vardır, yoxsa ondan bir şey istəyirsən?

O cavab verdi: Bizim aramızda heç bir yaxınlıq yoxdur. Məni bura İslam qardaşlığı və ona olan ehtiramımdan başqa bir şey gətirməyibdir. Əksinə aləmlərin Pərvərdigarına xatir ona salam verirəm və onu qoruyuram.

Mələk ona cavab verdi: Mən Allahın sənə tərəf



---

1- [1]. Həmin mənbə.

2- [2]. Həmin mənbə.

3- [3]. Həmin mənbə.

göndərdiyi mələyəm, Pərvərdigarın sənə salam çatdırır və buyurur ki, Məni ziyarət etdin və mənə xatir hörmət etdin. Mən cənnəti sənə vacib etdim, səni öz qəzəbimdən amanda saxladım və cəhənnəm odundan nicat verdim."(۱)

۶. İmam Sadiq (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Salam verməmişdən qabaq danışmağa başlayan kəsə cavab verməyin."

İmam Sadiq (ə) buyurdu: "Heç kimi salam verməyincə öz yeməyinizə dəvət etməyin."(۲)

## ۳۳. Salamın lazım olması, onu tərk...aid bölmə

۳۳. SALAMıN LAZıM OLMASı, ONU TəRK eTMəYIN MəKRUhLUğU Və SALAMıN CAVABıNıN VACIB OLMASıNA AID BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "Məktuba cavab vermək salamın cavabı kimi vacibdir. Salamı başlayan Allah və peyğəmbərin (s) yanında (cavab verəndən) daha yaxşı şəxsdir."(۳)

۲. İmam Sadiq (ə) nəql edir ki, Allah Əzzəvəcəl buyurdu: "Xəsis o kəsdir ki, salam verməyə də xəsislik etsin."(۴)

۳. İmam Cəfər Sadiq (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Salam vermək müstəhəb və onun cavabı isə vacibdir."(۵)



---

۱- [۱]. Səvabul-əmal, səh.۹۳.
۲- [۲]. Xisal, Səduq ۱-ci cild, səh.۱۳.
۳- [۳]. Ət-təkatub) Üsuli Kafi, səh.۶۲۶).
۴- [۴]. Ət-təslim) Üsuli Kafi, səh.۶۱۳).
۵- [۵]. Həmin mənbə.

## UCADAN SALAM VeRMəYIN Və SöZü YAXşı DANışMAğıN MüSTəhəBLIYINə AID .۳۴ BöLMə

İmam Məhəmməd Baqir (ə) buyurdu: "Allah Əzzəvəcəl ucadan salam verməyi .۱ (sevir."(۱)

İmam Baqir (ə) buyurdu: "Salman (Allahın ona rəhməti olsun) deyərdi: Allahın .۲ (salamını ucadan deyin. Çünki, Allahın salamı zülmkarlara çatmır."(۲)

İmam Cəfər Sadiq (ə) bir hədisdə nəql edir ki, həzrət Əli (ə) buyurardı: .۳ "Qəzəblənməyin və elə bir əməl etməyin ki, sizə də qəzəblənsinlər, salamı ucadan verin, yaxşı söz danışın, camaat yatanda siz gecə namazı qılın ki, cənnətə salamat ".gedəsiniz

Sonra həzrət (ə) Allah Əzzəvəcəlin bu sözünü onlar üçün oxudu: "O hər bir eybdən və (nöqsandan salamatdır, amanda saxlayandır və (bütün varlığı) qoruyandır."(۳) , (۴)

İmam Cəfər Sadiq (ə) buyurdu: "Təvazökarlığın əlamətlərindən biri budur ki, sən .۴ (görüşdüyün kəsə salam verəsən."(۵)

İmam Cəfər Sadiq (ə) atalarından nəql edir ki, peyğəmbərin (s) həzrət Əliyə (ə) olan .۵ vəsiyyətində belə gəlibdir: "Üç şey günahların üstünü örtməyə səbəb olur: Ucadan ,salam vermək, yemək vermək



---

.Həmin mənbə . [۱] -۱

.Həmin mənbə . [۲] -۲

.Həmin mənbə . [۳] -۳

.həşr surəsi, ayə ۳۳ . [۴] -۴

.(Üsuli Kafi, səh.۶۱۳ (Ət-təslim . [۵] -۵

(camaat yatanda gecə namazı qılmaq."(۱

۶. (İmam Sadiq (ə) buyurdu: "Xəsis o kəsdir ki, salam verməyə də xəsislik edir."(۲

۷. İmam Cəfər Sadiq (ə) öz atalarından nəql edir ki, peyğəmbər (s) buyurdu: "Cənnətdə içərisi çöldən və çölü də içəridən görsənən evlər vardır. Mənim ümmətimdən sözün yaxşısını deyənlər, camaatı yedizdirənlər, ucadan salam verənlər, oruc tutmağa davam edənlər və camaat yatanda gecə namazı qılanlar orada sakin olacaqlar."

həzrət Əli (ə) soruşdu: "Ey Allahın Rəsulu! Sizin ümmətinizdən bu əməlləri yerinə yetirməyə kim qadirdir?"

Peyğəmbər (s) buyurdu: "Ya Əli! Sözün gözəlliyi bilirsənmi nədir? İnsanın sübh və axşam vaxtı on dəfə "subhanəllah, vəl-həmdu lillah, və la ilahə illəllah, vəllahu əkbər" deməsidir, yemək vermək isə kişinin öz ailəsinə ehsan etməsindən ibarətdir, amma oruc tutmağa davam etməkdə məqsəd odur ki, insan ramazan ayını və başqa aylarda isə üç gün oruc tutsa, bu onun üçün bir ömrün orucu yazılar. Amma camaatın yuxuda olduğu halda gecə namazı qılmaqda məqsəd isə hər kəs məğrib, işa və sübh namazını məsciddə camaatla qılarsa, o bütün gecəni ibadətlə məşğul olmuş kimi sayılır. Salamı ucadan deməkdə məqsəd isə insan



---

۱- [۱] . "Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۲۳۶.
۲- [۲] . Məaniyul-əxbar, səh.۷۲.

(heç bir müsəlmana salam verməkdə xəsislik etməsin."(1)

8. İmam Məhəmməd Baqir (ə) buyurdu: "Üç şey insanın Allah yanında olan məqamını ucaldır: Ucadan salam vermək, təam vermək və camaat yatanda gecə namazı qılmaq."(2)

9. İmam Cəfər Sadiq (ə) buyurdu: "Görüşdüyün hər kəsə salam vermək təvazökarlığın əlamətlərindəndir."(3)

10. Peyğəmbər (s) buyurdu: "İnsanların ən zəifi dua etməkdə aciz olanı və ən xəsisi də salam verməyə xəsislik edənidir."(4)

11. İmam Sadiq (ə) buyurdu: "hər kim mənim üçün dörd şeyi yerinə yetirərsə, cənnətdə dörd evi mən onun üçün zəmanət verirəm: 1. Ehsan edib, kasıbçılıq və yoxsulluqdan qorxmamaq. 2. Öz mənafeyi müqabilində camaat barəsində ədalətə riayət etmək. 3. hər yerdə ucadan salam vermək. 4. haqq onunla olsa da belə mübahisəli söhbəti tərk etmək."(5)

### 35. Uşaqlara salam verməyin müstəhəbliyinə aid bölmə

1. İmam Riza (ə) öz atalarından nəql etmişdir ki, Rəsulullah (s) buyurdu: "Mən beş şeyi ömrümün axırına kimi tərk etməyəcəm: 1. Yerdə oturub



---

1- [1]. Məaniyul-əxbar, səh.73; Məcalis, Səduq səh.198.

2- [2]. Məaniyul-əxbar, səh.90.

3- [3]. Xisal, Səduq 1-ci cild, səh.9.

4- [4]. Məcalis, Şeyx Tusinin oğlu, səh.54.

5- [5]. Məhasin Bərqi, səh.8; Mən la yəhzuruhul-fəqih, 4-cü cild (ma təcibu fihi əz-zəkat); Üsuli Kafi, 6-cı cild, (cihadun-nəfs).

qullarla yemək yeməyi. ٢. Palansız ulağa minməyi. ٣. Öz əlimlə keçidən süd sağmağı. ۴. Yun (tüklü) paltarı geyinməyi. ۵. Məndən sonra sünnət (adət-ənənə) olsun deyə (uşaqlara salam verməyi."(١

İmam Sadiq (ə) atalarından nəql etmişdir ki, peyğəmbər (s) buyurdu: "Beş şeyi ölüm .٢ anına qədər tərk etməyəcəm: ١. Yun paltar geyinmək. ٢. Palansız ulağa minmək. ٣. Qullarla yemək yemək. ۴. Öz əlimlə ayaqqabı yamamaq. ۵. Məndən sonra sünnət olsun (deyə uşaqlara salam vermək."(٢

**Yoxsulla varlıya salam verəndə fərq...aid bölmə .٣۶**

YOXSULLA VARLıYA SALAM VeRəNDə FəRQ QOYMAğıN hARAMLığıNA Və O IKI .٣۶ NəFəRIN ARASıNDA BəRABəRLIYə RIAYəT eTMəYIN VACIBLIYINə AID BöLMə

İmam Riza (ə) buyurdu: "hər kim yoxsul bir müsəlmanla görüşəndə ona salam versə .١ və onun bu salamının varlı şəxsə verdiyi salamla fərqi olarsa, qiyamət günündə (Allahla, ona qəzəbləndiyi halda görüşəcək."(٣

həccal deyir ki, Cəmil ibn Dərraca dedim: Peyğəmbər (s) buyurub ki, böyük bir .٢ ?tayfanın başçısı sizin yanınıza gələndə ona ehtiram edin

.Cəmil dedi: Bəli, peyğəmbər (s) buyurmuşdur

?Cəmildən soruşdum: (Bu hədisdə) şərəf sahibindən məqsəd kimdir



---

İləluş-şəraye, səh.۵۴; Uyunu əxbarir-Riza, səh.٢٣۵; Məcalis, Səduq səh.۴; Xisal,. [١] -١ .١-ci cild, səh.١٣٠

.Xisal, Səduq ١-ci cild, səh.١٣٠ . [٢] -٢

.Uyunul-əxbar, səh.٢١۵; Məcalis, Səduq səh.٢۶۵ . [٣] -٣

O cavab verdi: İmam Sadiqdən (ə) bu barədə soruşdum, o həzrət (ə) buyurdu: Bu (hədisdəki şərəf sahibindən məqsəd sərvət və var-dövlət sahibidir.(١)

## İslam və sağlamlıq neməti üçün...aid bölmə .٣٧

İSLAM Və SAğLAMLıQ NeMəTI üçüN ALLAhA şüKR eTMəYIN MüSTəhəBLIYINə AID .٣٧ BöLMə

İmam Cəfər Sadiq (ə) öz atalarından nəql edir ki, peyğəmbər (s) buyurdu: "hər kim .١ yəhudini, ya xaçpərəsti, ya zərdüştü və ya da qeyri-müsəlmanlardan birini görəndə belə desin: "Məni səndən fəzilətli edən, İslamı dinim, Quranı kitabım, Məhəmmədi (s) peyğəmbərim, həzrət Əlini (ə) imamım və rəhbərim, möminləri qardaşım və Kəbəni də qibləm təyin edən Allaha şükr olsun." Allah o qeyri-müsəlmanla mömini cəhənnəmdə (bir yerdə gətirməyəcək."(٢)

İmam Cəfər Sadiq (ə) buyurdu: "hər kim bəla gəlmiş şəxsi (cüzama və bunun kimi .٢ xəstəliyə tutulanı), ya şikəsti, ya da giriftar olmuş insanı görəndə o eşitməmiş gizlicə üç dəfə: "Səni giriftar etdiyi şeylərdən məni sağ və salamat saxlayan Allaha şükr olsun. Əgər Allah istəsəydi məni də giriftar edə bilərdi."-desə, heç vaxt bu bəlalar ona ".gəlməz



---

.Rövzeyi Kafi, səh.٢١٩ .[١]-١

.Məcalis, Səduq səh.١۶١; Səvabul-əmal, səh.١۵; Qurbul-əsnad, səh.٣۴ .[٢]-٢

## Ucadan salam vermək və eşitmək üçün...aid bölmə .۳۸

UCADAN SALAM VeRMəK Və eşITMəK üçüN CAVAB VeRMəYIN LAZıM OLMASıNA .۳۸ AID BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "hər kəs salam verərsə, gərək ucadan salam versin və sonra deməsin ki, salam verdim amma salamın cavabını vermədilər və bəlkə də o salamı eşitmədilər. Gərək salamın cavabını da ucadan desinlər ki, salam verən müsəlman deməsin ki, mənim salamımın cavabını vermədilər."(۱)

## Salam verməyin qaydası və...aid bölmə .۳۹

SALAM VeRMəYIN QAYDASı Və SALAM üçüN MüNASIB SöZLəRI SeçMəYIN . ۳۹ MüSTəhəBLIYINə AID BöLMə

۱. Həsən ibn Munzir deyir ki, imam Sadiq (ə) buyurdu: "hər kim "əs-səlamu ələykum" deyərsə, onun on savabı, hər kim "səlamun ələykum və rəhmətullah" deyərsə, onun iyirmi savabı və hər kim "səlamun ələykum və rəhmətullahi və bərəkatuh" deyərsə, onun otuz savabı vardı."(۲)

۲. İmam Sadiq (ə) nəql edir ki, əmirəlmöminin (ə) buyurdu: "İnsan salam verməmişdən qabaq "həyyakəllah" (Allah səni sağ-salamat etsin) deyib sakit olarsa, bu məkruhdur."(۳)

۳. Əmmar Sabati imam Sadiqdən (ə) qadınların salam verməsi barəsində soruşdu və imam (ə) buyurdu: "Qadın "ələykumus-səlam" və kişi də



---

۱- [۱] . Üsuli Kafi, səh.۶۱۳ (ət-təslim).

۲- [۲] . Həmin mənbə.

۳- [۳] . Həmin mənbə.

(cavabında "əssəlamu ələykum" desin."(۱)

۴. Vəhəb Yəmani bir hədisdə nəql etmişdir ki, Allah-taala Adəmə (ə) buyurdu: "Mələklərin bu dəstəsinə tərəf yaxınlaş və onlara de: "Əssəlamu ələykum və rəhmətullahi və bərəkatuh" (Sizə Allahın salamı, rəhməti və bərəkəti olsun)."

həzrət Adəm (ə) onlara salam verdi və mələklər cavab verdilər: "Və ələykəssəlamu və rəhmətullahi və bərəkatuh."

O, Allahın hüzuruna qayıdanda Allah taala buyurdu: "Sənin və övladlarının bu salamı qiyamətə qədər onların arasında qalacaq."(۲)

**۴۰. Salam verəndən sonra cavab verilməyəndə...aid bölmə**

۴۰. SALAM VeRəNDəN SONRA CAVAB VeRILMəYəNDə ONU üç DəFə TəKRAR eTMəYIN Və DAXIL OLMAQ üçüN ICAZə ISTəMəYIN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Məhəmməd Baqir (ə) nəql edir ki, Əmirəlmöminin (ə) Bəni Səd tayfasından olan bir kişiyə buyurdu: "Özüm və Fatimə (ə) barəsində sənə danışmayım?"

həzrət (ə) daha sonra buyurdu: "Bir gün səhər tezdən yataqda olanda peyğəmbər (s) bizim yanımıza gəldi və buyurdu: Əssəlamu ələykum.

Biz sükut etdik və həya edib yerimizdən qalxmadıq. həzrət (s) bir daha buyurdu: Əssəlamu ələykum.

Biz yenə də sükut etdik. həzrət (s) yenə də



---

۱- [۱]. "Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۱۵۲.

۲- [۲]. İləluş-şəraye, səh.۴۵.

.buyurdu: Əssəlamu əleykum

Qorxduq ki, əgər həzrətin (s) salamının cavabını verməsək, o qayıtsın. O həzrət (s) adəti üzrə üç dəfə salam verəndən sonra, əgər daxil olmağa icazə verməsəydilər .qayıdardı. Biz dedik: "Və əleykumussəlam" ya Rəsulullah! Evə buyurun

Həzrət (s) daxil oldu və daha sonra peyğəmbər (s) o iki nəfərə həzrət Fatimənin (ə) təsbihini yatmamışdan öncə deyilməsini, namazın təqibatında olduğu kimi bəyan (etdi."(١)

İmam Sadiq (ə) (həzrət Rəsulun (s) Əliyə (ə) köynək almaq üçün verdiyi) on iki . ٢ dirhəmə aid hədisində buyurdu ki, peyğəmbər (s) (sahibinin on iki dirhəmini itirmiş) bir kənizə buyurdu: "Mənim qabağıma düş və mənə öz ailənə tərəf getmək üçün yol ".göstər

".Peyğəmbər (s) evin qapısına çatanda buyurdu: "Əssəlamu əleykum

Onlar cavab vermədilər. həzrət (s) iki dəfə salam verdi və onlar yenə də cavab vermədilər. Üçüncü dəfə isə salam verəndə onlar dedilər: "Ey Allahın Rəsulu! Sənə ".Allahın salamı, rəhməti və bərəkəti olsun

"?Peyğəmbər (s) soruşdu: "Niyə birinci və ikinci dəfədə salamın cavabını vermədiniz

Onlar dedilər: "Ey Allahın Rəsulu! Biz sənin salamını eşitdik, lakin daha çox eşitmək (istədik."(٢)



---

.(Mən la yəhzuruhul-fəqih", səh.٣٢١, (kitabus-səlat" . [١]-١

.Xisal, Səduq ٢-ci cild, səh.٨٧; Əmali, Səduq səh.١۴۴ . [٢]-٢

**Möminə salam verəndə, asqıranda, onu dua edəndə...aid bölmə .۴۱**

MöMINə SALAM VeRəNDə, ASQıRANDA, ONU DUA eDəNDə Və SAIR YERLəRDə .۴۱ ONA CəM hALıNDA (SIZ DEYəRəK) MüRACIəT eTMəYIN MüSTəhəBLIYINə AID BöLMə

İmam Sadiq (ə) buyurdu: "Üç yerdə insana cəm halında müraciət olunur: ۱. . ۱ Asqıranda, əgər onunla bir şəxs olmasa "yərhəmukumullah" deyirsən. ۲. Ona salam (verəndə "əssəlamu ələykum" deyirsən. ۳. Başqaları üçün deyirsən-əfakumullah."(۱)

.Xisal" kitabında bu hədis kimi başqa bir hədis də nəql olunmuşdur" .۲

**Cənazə ilə birlikdə olana, ya cümə...aid bölmə .۴۲**

CəNAZə ILə BIRLIKDə OLANA, YA CüMə NAMAZıNA GeDəNə Və YA hAMAMDA .۴۲ OLANA SALAM VeRMəYIN MüSTəhəB OLMAMASıNA AID BöLMə

İmam Sadiq (ə) buyurdu: "Üç nəfərə salam vermək lazım deyil: ۱. Cənazəni müşayiət .۱ (edənə. ۲. Cümə namazına gedənə. ۳. hamamda olana."(۲)

**Hazır olanın və hüzuru olmayanın...aid bölmə .۴۳**

HAZıR OLANıN Və hüZURU OLMAYANıN SALAMıNıN CAVABıNı VeRMəYIN . ۴۳ QAYDASıNA AID BöLMə

İmam Baqir (ə) buyurur ki, Əmirəlmöminin (ə) bir dəstə camaatın yanından keçdi və .۱ onlara salam verdi. Onlar da salamın cavabını verdilər: "Allahın sənə salamı, rəhməti, ".bərəkəti, məğfirəti və razılığı olsun

həzrət (ə) onlara buyurdu: "Bizə mələklərin atamız İbrahimə (ə) salam verdiyi salamı .deyin



---

.Üsuli Kafi, səh.۶۱۳ . [۱]-۱

.Üsuli Kafi, səh.۶۱۳ . [۲]-۲

(Onlar həzrət İbrahimə (ə) dedilər: Siz əhli-beytə Allahın rəhməti və bərəkəti olsun."(١)

٢. Həkəm ibn Uyeynə deyir: Bir gün imam Baqirin (ə) xidmətində idim və o həzrətin (ə) evi cəmiyyətlə dolu idi. Bir nəfər kişi gəlib qapının ağzında dayanıb, dedi "Əssəlamu ələykə yəbnə Rəsulillah və rəhmətullahi və bərəkatuh" (ey Allahın Rəsulunun oğlu! Sənə Allahın salamı, rəhməti və bərəkəti olsun) və sakit oldu. İmam Baqir (ə) buyurdu: "Və ələykəssəlam və rəhmətullahi və bərəkatuh."

O daha sonra üzünü camaata tutub salam verdi və hamı onun salamının cavabını qaytardı."(٢)

٣. Əbu Kəhməş deyir: "İmam Sadiqə (ə) ərz etdim ki, Abdulla ibn Əbi Yəfur sizə salam çatdırır. İmam (ə) buyurdu: "Və ələykə və ələyhissəlam." (Sənə və ona salam olsun) Əgər Abdullanı görsən mənim salamımı ona çatdır."(٣)

٤. İmam Məhəmməd Baqir (ə) buyurdu: "Bir mələk Allahdan istədi ki, öz bəndələrinin duasını eşitmək qüdrətini ona bağışlasın. Allah onun duasını qəbul etdi və o zamandan bəri hər hansı bir mömin "səlləllahu əla Muhəmmədin və alihi və səlləm" (Allahın salamı Məhəmmədə və onun əhli-beytinə olsun) deyərsə, o mələk cavabında deyər: "Və



---

١- [١] . Həmin mənbə.

٢- [٢] . Rövzeyi Kafi, səh.٧۶.

٣- [٣] . Üsuli Kafi, səh.٣۶٠.

ələykəssəlam". Daha sonra o mələk peyğəmbərə (s) ərz edər: Filankəs sənə salam .göndərdi

(Rəsulullah (s) cavabında buyurar: Ona da salam olsun."(١

İmam Baqir (ə) buyurdu: Bir gün imam Əli (ə) "Rəhbə"də (Kufə məhəlləsindən . ۵ birində) oturmuşdu və camaat da onu dövrəyə almışdılar. Bir kişi ayağa qalxdı və dedi: "Əssəlamu ələykə ya əmirəlmömininə və rəhmətullahi bərəkatuh" (Ey möminlərin .(rəhbəri! Sənə Allahın salamı, rəhməti və bərəkəti olsun

Həzrət (ə) ona baxdı və buyurdu: "Və ələykəssəlamu və rəhmətullahi və bərəkatuh." ?Sən kimsən

O kişi özünü təqdim etdi və daha sonra suallarını soruşdu. O sualların biri digərindən (daha da çətin idi."(٢

Peyğəmbər (s) buyurdu: "Namazı yaxud salam verməyi naqis qoymaq caiz deyil. . ۶ Namazın naqisliyi rükunu ya da səcdələri yarımçıq qurtarmaq və sonrakı rəkəti də yarımçıq davam etməkdir. Salamın da naqisliyi isə odur ki, salam verəndə "əssəlamu ələykə" desin və yaxud salamın cavabında "və ələykumussəlam" yox, "və ələykə" (desin."(٣

Əli ibn İbrahim Allahın buyurduğu "(Ya Məhəmməd!) öz ailənə namazı əmr et və . ٧ özün var gücünlə ona



---

.Məcalis, Səduq səh.۶٧ . [١]-١
.Xisal, Səduq ٢-ci cild, səh.۵۶ . [٢]-٢
.Məaniyul-əxbar, səh.٨٢ . [٣]-٣

səbr et"(1) ayənin təfsirində deyir: "Rəsulullah (s) hər gün sübh namazı vaxtı həzrət Əlinin, Fatimənin, Həsənin və Hüseynin evlərinin qapısına gəlib buyurardı: "Əssəlamu ələykum və rəhmətullahi və bərəkatuh" (Sizə Allahın salamı, rəhməti və bərəkəti olsun!) Onlar deyərdilər: "Və ələykumussəlamu ya Rəsuləllahi və rəhmətullahi və bərəkatuh." Sonra isə peyğəmbər (s) buyurardı: Allah sizə rəhmət etsin, namaz vaxtıdır."(2)

### ۴۴. Başqa yerdə iqamət salan və səfərdə...aid bölmə

۴۴. BAşQA YeRDə IQAMəT SALAN Və SəFəRDə OLANLA QUCAQLAşMANıN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "Bir məntəqədə iqamət salan sakinin salamının kamil olması onun əl görüşməsi və səfərə çıxanın isə bir-biriylə qucaqlaşmasıdır."(3)

### ۴۵. Kiçiyin böyük şəxsə, az bir cəmiyyətin çox...aid bölmə

۴۵. KIçIYIN BöYüK şəXSə, AZ BIR CəMIYYəTIN çOX CəMIYYəTə, PIYADANıN OTURANA Və SAIR SALAM VeRMəYIN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Cəfər Sadiq (ə) buyurdu: "Gərək kiçik böyüyə, piyada oturana, az cəmiyyət isə çoxa salam versin."(4)

۲. İmam Sadiq (ə) buyurdu: "Əgər məclisdə bir dəstə insan olarsa, içəri daxil olanlar gərək salam versinlər."(5)



---

۱- [۱]. Taha surəsi, ayə ۱۳۲.

۲- [۲]. Təfsiri Qumi, səh.۴۲۵.

۳- [۳]. Üsuli Kafi, səh.۶۱۳.

۴- [۴]. babu mən yəcibu ən yubdəə bissəlam) Üsuli Kafi, səh.۶۱۴).

۵- [۵]. Üsuli Kafi, səh.۶۱۴.

۳. İmam Sadiq (ə) buyurdu: "Az dəstə çoxa, atlı piyadaya, dəvəyə minənlər ulağa minənlərə, atlılar da dəvəyə minənlərə salam verməlidirlər."(۱)

۴. İbn Bukeyr dostlarının birindən nəql edir ki, eşitdim imam Sadiq (ə) buyurardı: "Atlı adam piyadaya, piyada da oturana salam versin, iki dəstə bir-birləri ilə görüşəndə isə onlardan az olan dəstə çoxa, tək olan adam da camaata salam versin."(۲)

۵. İmam Sadiq (ə) buyurdu: "Atlı piyadaya və ayaq üstə duran da oturan şəxsə salam versin."(۳)

## ۴۶. Bir dəstədən bir nəfərin onların...aid bölmə

۴۶. BIR DəSTəDəN BIR NəFəRIN ONLARıN hAMıSıNıN əVəZINə SALAM VeRMəSI Və həMçININ BIR DəSTəDəN Də BIR NəFəRIN ONLARıN əVəZINə CAVAB VeRMəSI KIFAYəT eDəR

۱. İmam Sadiq (ə) buyurdu: "Əgər camaatın içərisindən bir nəfər onların hamısının əvəzinə salam verərsə bu kifayət edir."(۴)

۲. İmam Sadiq (ə) buyurdu: "Əgər bir dəstənin içərisindən bir nəfər onların hamısının əvəzinə salam verərsə, kifayət edər və həmçinin əgər biri cavab verərsə bu başqalarının öhdəsindən götürülər."(۵)

۳. İbn Bukeyr dostlarının birindən nəql edir ki, imam Sadiq (ə) buyurdu: "Əgər bir dəstə adam



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. Həmin mənbə.

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. babun iza səlləmə vahidun minəl-cəmaəti uczıə) Üsuli Kafi, səh.۶۱۴).

۵- [۵]. Üsuli Kafi, səh.۶۱۴.

camaatın yanından keçəndə o dəstədən biri camaata salam verərsə kifayət edər və (həmçinin əgər bir nəfər də cavab versə, kifayətdir."(١

٤. Zeyd ibn Əsləm deyir ki, Rəsulullah (s) buyurdu: "Gərək atlı adam piyadaya salam versin və əgər bir dəstənin içərisindən bir nəfər salam versə, digərlərinin öhdəsindən (götürülər."(٢

### ۴٧. Təqiyyə halında olanda da belə...aid bölmə

۴٧. TəQIYYə hALıNDA OLANDA DA BeLə MöMINə SALAM VeRMəYI TəRK eTMəYIN MəKRUhLUğUNA AID BöLMə

١. İshaq ibn Əmmar deyir ki, mən Kufə məscidində təqiyyəyə görə dostlarıma salam vermirdim. İmam Sadiqin (ə) xidmətində olanda həzrət (ə) mənə buyurdu: "Niyə "?dostlarına zülm edirsən və onlarla rastlaşanda salam vermirsən

".Mən cavab verdim: "Bu əməl təqiyyə görədir

həzrət (ə) buyurdu: "Təqiyyə görə salamı tərk etmək sənin vəzifən deyil. Əksinə sənin vəzifən salamı çatdırmaq və yaymaqdır. Mömin adam imanlı şəxsləri görüb onlara salam verəndə mələklər cavab verərlər: Səlamun ələykum və rəhmətullahi və (bərəkatuh."(٣

### ۴٨. Kişinin qadına salam verməsinin caiz olmasına aid bölmə

١. Rəbi ibn Abdulla imam Sadiqdən (ə) nəql edir



---

١-[١] . Həmin mənbə.

٢-[٢] . Məcalis, Şeyx Tusinin oğlu, səh.٢٢٩.

٣-[٣] . Kəşful-ğəmmə, səh.٢٣٧.

ki, peyğəmbər (s) qadınlara salam verərdi və onlar da o həzrətin (s) salamının cavabını verərdilər. Əmirəlmöminin (ə) də həmçinin qadınlara salam verərdi. Ancaq həzrət (ə) cavan qadınlara salam verməyi məkruh bilərdi və buyurardı: "Qorxuram ki, onların səsi mənim xoşuma gəlsin və mənim savabımdan azalsın."(1)

## 49. Kafirlərə, əyyaşlara və bunun kimi...aid bölmə

49. KAFIRLəRə, əYYAşLARA Və BUNUN KIMI ADAMLARA ZəRURəTDəN BAşQA hALDA SALAM VeRMəYIN hARAM OLMASı Və ONLARıN SALAMLARıNA CAVAB VeRMəYIN QAYDASıNA AID BöLMə

1. İmam Sadiq (ə) Əmirəlmöminindən (ə) nəql edib buyurmuşdur: "Kitab əhlinə siz birinci salam verməyin. Əgər onlar sizə salam versələr "və ələykum" deyin.(2)

2. İmam Sadiq (ə) buyurdu: "Yəhudi və xaçpərəstin salamının cavabında "salam" sözünü deyin."(3)

3. İmam Cəfər Sadiq (ə) buyurdu: "Əgər yəhudi, ya xaçpərəst və ya da müşrik sənə salam verərsə, "ələykə" sözünü de."(4)

4. İmam Məhəmməd Baqir (ə) buyurur ki, yəhudi bir kişi peyğəmbərin (s) hüzuruna gəldi və Aişə də orada idi. Yəhudi dedi: "Əssamu ələykum" (mənası "ölüm olsun sizə").



---

1- [1]. babut-təslim ələn-nisa) Üsuli Kafi, səh.614).

2- [2]. babut-təslim əla) Üsuli Kafi, səh.615

3- [3]. Həmin mənbə.

4- [4]. Həmin mənbə.

.(Peyğəmbər (s) buyurdu: "Ələykum" (sizə də

Başqa bir yəhudi də gəldi və əvvəlki yəhudi kimi salam verdi. Həzrət (s) həmin cavabı ona da dedi. Üçüncü yəhudi də gəlib əvvəlki o iki nəfər kimi dedi və peyğəmbər (s) həmin cavabı ona da buyurdu. Aişə qəzəblənib dedi: "Allahın ölümü, qəzəbi və lənəti "!sizə olsun ey yəhudilər, ey meymunların və donuzların qardaşları

Rəsulullah (s) Aişəyə buyurdu: "Əgər nalayiq sözlər öz şəklində mücəssəm olarsa, çox pis görsənərdi. Mehribanlıq və mülayimlik da hər bir şeydə olarsa onu gözəlləşdirər və ".əgər hər bir şeydən götürülərsə onu çirkin göstərər

Aişə dedi: "Ey Allahın Rəsulu! Onların sözlərini eşitmədinmi ki, "əssamu ələykum" (sizə ".ölüm olsun) dedilər

Peyğəmbər (s) buyurdu: "Bəli, eşitdim. Sən mənim onlara verdiyim cavabı eşitmədin? ".(Onlara dedim ki, "ələykum" (yəni sizə də ölüm olsun

Daha sonra peyğəmbər (s) buyurdu: "Əgər müsəlman bir adam sizə salam verərsə, siz də ona "səlamun ələykum" deyin və əgər kafir şəxs sizə salam verərsə, siz ona ("ələykə" deyin."(١

İmam Cəfər Sadiq (ə) buyurdu: "Yəhudi bir şəxs peyğəmbərin (s) yanına gəldi və .۵ ".dedi: Əssamu ələykum



---

.Həmin mənbə .[١]-١

".Peyğəmbər (s) buyurdu: "Ələykə

".Peyğəmbərin (s) əshabı dedilər: "O sənə ölüm olsun dedi

(Peyğəmbər (s) buyurdu: "Mən də ona dediyi kimi cavab verdim."(١

Sumaə deyir ki, imam Sadiqdən (ə) soruşdum: "Əgər bir müsəlman oturarsa və .۶ yəhudi, ya xaçpərəst, ya da müşrik bir şəxs ona salam verərsə, o cavabını necə "?verməlidir

(həzrət (ə) buyurdu: "Ələykum desin."(٢

İmam Baqir (ə) buyurdu: "Əbu Cəhl və Qüreyşin bir dəstəsi Əbu Talibin yanına gəlib .٧ dedilər: Sənin qardaşın oğlu (həzrət Məhəmməd) bizə əziyyət verir. Ona de ki, bizim .allahlarımızdan əl çəksin və bizim də həmçinin onun Allahıyla işimiz olmasın

Əbu Talib peyğəmbəri (s) çağırdı. Peyğəmbər (s) içəri girəndə orada müşrikləri gördü ".(və buyurdu: "Əssəlamu əla mənittəbəl-huda" (O burada salam sözünü işlətmədi

Əsbəğ ibn Nəbatə deyir ki, imam Əli (ə) buyurdu: "Altı dəstəyə salam vermək lazım .٨ .deyil: ١. Yəhudiyə. ٢. Xaçpərəstə. ٣. Nərd və şahmat oynayana

Musiqi və spirtli içki əhlinə. ۵. Bir-birlərinin analarına söyüş söyməklə zarafat. ۴ (edənlərə. ۶. Şairlər (nalayiq adamlara tərif və mədh deyən şairlərə)."(٣



---

.Həmin mənbə .[١]-١

.Həmin mənbə .[٢]-٢

.Sərair, səh.۴٨۴ .[٣]-٣

۹. İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Siz kitab əhlinə yəni yəhudiyə və xaçpərəstə əvvəl salam verməyin. Əgər onlar sənə salam versələr, siz "ələykum" deyin və əgər məcbur olmasanız onlarla əl görüşməyin, onları künyəsi ilə çağırmayın."(۱)

## ۵۰. Başqasının evinə icazəsiz, xəbərsiz, salamsız və...aid bölmə

۵۰. BAşQASıNıN eVINə ICAZəSIZ, XəBəRSIZ, SALAMSıZ Və SAIR şəKILDə DAXIL OLMAğıN CAIZ OLMAMASıNA AID BöLMə

۱. Əbdürrəhman ibn Əbi Əbdillah deyir ki, imam Sadiqdən (ə) Allah Əzzəvəcəlin buyurduğu: "Ey iman gətirənlər! Öz evinizdən başqa heç bir evə icazə almayınca və həmin evin adamlarına salam verməyincə daxil olmayın."(۲) ayəsinin barəsində soruşdum. İmam (ə) buyurdu: "Burada "istinas" kəlməsindən məqsəd evə daxil olanda səsini ucaltmaq və salam verməkdir."(۳)

۲. Əbu Sibah deyir ki, imam Məhəmməd Baqirdən (ə) Allah Əzzəvəcəllin buyurduğu "Evlərə daxil olan zaman özünüzə salam verin"(۴) ayəsi barəsində soruşdum. İmam (ə) buyurdu: "Burada məqsəd ev əhlinə salam verməkdir və ona salamının cavabını verəndə isə onun verdiyi bu salam onun özünə qayıdır."(۵)

۳. İmam Baqir (ə) buyurdu: "Öz evinizə daxil olanda əgər evdə adam varsa, ona salam verin və elə



---

۱- [۱] . Qurbul-əsnad, səh.۶۲.

۲- [۲] . Nur surəsi, ayə ۶۱.

۳- [۳] . Məaniyul-əxbar, səh.۵۲.

۴- [۴] . Nur surəsi, ayə ۲۴.

۵- [۵] . Məaniyul-əxbar, səh.۶۲.

ki, heç kim olmasa "əssəlamu ələyna min indina" (Bizə Allahımız tərəfindən salam olsun!) Çünki Allah Əzzəvəcəl buyurdu: Bərəkətli və pak bir salam Allah (tərəfindəndir."(۱) (۲

**Evlərinə gedib gəlməyin lazım olduğu adamlara aid bölmə .۵۱**

EVLəRINə GeDIB GəLMəYIN LAZıM OLDUğU ADAMLARA AID BöLMə .۵۱

Əmirəlmöminin (ə) buyurdu: "Keçmişdə hikmət sahibləri deyiblər ki, insanın bəzi .۱ adamlarla get-gəl etməsi on şeyə görə lazımdır: ۱. Vacib əməlləri, haqqı və ibadəti yerinə yetirmək üçün Allah evi. ۲. İtaəti Allaha itaət sayılan hakimlərin evi və onların haqqına riayət etmək vacib, faydaları çox və zərərləri də ağır olur. ۳. Elmi din və dünyaya faydası olan alimlərin evi. ۴. Mal-dövlətini Allaha şükr etmək, axirət savabı üçün paylayan səxvaətli insanların evləri. ۵. Baş vermiş hadisələrdə ehtiyacı olan, çətinlikləri aradan qaldırmaq üçün köməyi dəyən, ağıl cəhətindən qüsurlu olan insanların evləri. ۶. Mərdliyi, bağışlamağı və köməyini əsirgəməyən nüfuz sahiblərinin evləri. ۷. İnsan təfəkkürünün inkişafı üçün məsləhət verən, fikir və nəzərləri mühüm sayılan adamların evi. ۸. Əlaqə yaratmaq və haqqlarına riayət edilməsi vacib olan mömin qardaşların evi. ۹. Şərri və düşmənçiliyi, mülayimlik, yumşaqlıq və mehribançılıqla aradan qaldırılan düşmənlərin evi. ۱۰. İnsanın tərbiyəsinə və



---

.Nur surəsi, ayə ۶۱ . [۱]-۱

.Təfsir Qumi, səh.۴۶۲ . [۲]-۲

(mədəniyyətinə təsir edənlərlə görüşmək və danışılması lazım olan adamların evi."(١

**Məclisdən qalxanda salam verməyin müstəhəbliyinə aid bölmə .۵۲**

MəCLISDəN QALXANDA SALAM VeRMəYIN MüSTəhəBLIYINə AID BöLMə .۵۲

İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "hər kim bir məclisdən çıxarsa, .١ qardaşlarından ayrılanda onlara salam verərsə, onlar da xeyir bir iş barəsində söhbətlə məşğuldurlarsa, o həmin xeyir işdə şərikdir və əgər batil bir işlə məşğul olsalar, bunun ona heç bir günahı yoxdur."(٢

Məkarimul-əxlaq" kitabında Rəsulullahdan (s) nəql olunur: "Əgər sizlərdən biri" .٢ məclisdən çıxmaq istəyərsə, salam versin. Çünki məclisin əvvəlindəki salamın axırında deyilən salamla fərqi yoxdur."(٣

(İmam (ə) buyurdu: De ki, Allah dünya işlərində sənə bərəkət versin."(۴

**Kafir) zimmi şəxsə ehtiyac zamanı...aid bölmə) .۵۳**

KAFIR) ZIMMI şəXSə ehTIYAC ZAMANı SALAM VeRMəYIN Və DUA eTMəYIN CAIZ) .۵۳ OLMASıNA AID BöLMə

Əbdürrəhman ibn həccac deyir ki, Əbül-Həsən imam Musa Kazıma (ə) ərz etdim: .١ "Xaçpərəst hakimə ehtiyacım olanda müraciət etməyim barəsində sizin nəzəriniz "?nədir? Ona salam verib və onun üçün dua edə bilərəm

(Həzrət (ə) buyurdu: "Bəli, ancaq sənin duanın ona heç bir faydası olmaz."(۵



---

.Xisal, Səduq ٢-ci cild, səh.۴٨ . [١] -١

.Qurbul-əsnad, səh.٢٢ . [٢] -٢

.Məkarimul-əxlaq, səh.١۵ . [٣] -٣

.Həmin mənbə . [١] -۴

.Üsuli Kafi, səh.۶١۵ . [۴] -۵

İmam Riza (ə) buyurdu: "İmam Sadiqə (ə) dedilər ki, yəhudiyə və xaçpərəstə necə .۲ ?dua edim

**Müsəlmanın zimmə əhli ilə məktublaşmasının caiz olmasına aid bölmə .۵۴**

Abdulla ibn Sənan deyir ki, imam Sadiqdən (ə) soruşdular: "Bir kişi mühüm vəzifədə .۱ "?işləyən zərdüştə məktub yazır. Onun adını öz adından qabaq yazması caizdir

(İmam (ə) buyurdu: "Mənfəət məqsədi ilə olsa iradı yoxdur."(۱

Əbu Bəsir deyir ki, imam Sadiqdən (ə) soruşdular: "Bir nəfər zərdüştə, ya yəhudiyə, .۲ ya xaçpərəstə və ya da yaşadığı məntəqənin böyük və vəzifəli şəxsinə ehtiyacı vardır. O, ehtiyacına görə ona məktub yazmaqda naçardır. O, məktubunda həmin kafirin "?adını yazıb və istəyinin yerinə yetməsi üçün ona salam verə bilər

İmam (ə) buyurdu: "Məktubun əvvəlində onun adını yazması caiz deyil. Ancaq sən ona yazdığın məktubun əvvəlində salam ver. Allahın peyğəmbəri (ə) də Roma və İran (padşahına məktub yazardı."(۲



---

.(Üsuli Kafi, səh.۶۱۶ (Mukatəbətu əhlil-zimməti . [۲] -۱
.Həmin mənbə . [۳] -۲

## ۵۵. Xızır peyğəmbərin (ə) adı çəkiləndə...aid bölmə

۵۵. XıZıR PeYğəMBəRIN (ə) ADı çəKILəNDə ONA SALAM VeRMəYIN MüSTəhəBLIYINə AID BöLMə

۱. Həsən ibn Əli ibn Fəzzal deyir ki, Əbül-Həsən Əli ibn Musa ər-Riza (ə) buyurdu: "Xızır həyat suyu içmiş və İsrafilin şeypuru səslənənə kimi ölməyəcək. O bizim yanımıza gəlir və bizə salam verir və biz də onun səsini eşidirik, amma özünü görmürük. Harada onun adını çəksələr o hazır olur. Sizlərdən hər kim onun adını çəkərsə gərək ona salam versin."(۱)

## ۵۶. Dostlar üçün göz yummaq və güzəşt etməyin müstəhəbliyinə aid bölmə

۱. Sələbə ibn Meymun deyir ki, bir dəstə adam imam Sadiqin (ə) hüzurunda idilər və imam (ə) onlar üçün hədis buyurardı. Onlardan biri başqa bir şəxsin adını çəkib onun dalınca pis danışdı və imama (ə) şikayət etdi. İmam (ə) buyurdu: "İndi dostluğu kamil olan haradadır və əxlaqı kamil olan adam hanı?"(۲)

۲. İmam Cəfər Sadiq (ə) buyurdu: "İnsanların (batini və ruhi cəhətləri) barəsində çox axtarış aparma, yoxsa dostsuz qalarsan."(۳)



---

۱- [۱]. Kəmaluddin, səh.۲۱۹. hədisin davamında deyilir: O hər il həcc mövsümündə Məkkəyə gedir, bütün həcc əməllərini yerinə yetirir, möminlərin duasının cavabında amin deyir və o tək olanda Allah onunla həzrət Mehdi (ə) arasında ünsiyyət yaradır.

۲- [۲]. Üsuli Kafi, səh.۶۱۰ (babul-əğza).

۳- [۳]. Həmin mənbə.

۳. Zəhhak ibn Muxəllid deyir ki, imam Sadiqdən (ə) eşitdim ki, buyurdu: "Dostlardan kamil ədalətin intizarını çəkmək insafdan deyil."(۱)

## ۵۷. Müsəlman asqıranda onun üçün dua etməyin müstəhəbliyinə aid bölmə

۱. İmam Sadiq (ə) buyurdu: "Müsəlmanın digər müsəlman qardaşının boynunda bir neçə haqqı vardır:

۱. Onunla görüşəndə salam versin. ۲. Xəstələnəndə ona baş çəksin. ۳. O özü olmayanda onun üçün əsl dost olsun. ۴. Asqıranda onun üçün dua etsin. Asqıran "Əlhəmdu lillahi rəbbil-aləmin, la şərikə ləh" və müsəlman qardaşı isə "yərhəmukəllah" desin. O isə cavabında "yəhdiykumullahu və yuslih baləkum" (Allah sizi doğru yola yönəltsin və güzəranınız yaxşılaşsın) desin. ۵. Onun dəvətini qəbul etsin. ۶. O vəfat edərsə, onun cənazəsinin dəfnində iştirak etsin."(۲)

۲. İmam Sadiq (ə) Rəsulullahdan (s) nəql edib buyurubdur: "Əgər kimsə asqırarsa ona dua edin və hərçənd ki, o arxanızdakı adadan (uzaq yoldan) olsa da belə."(۳)

۳. Başqa bir rəvayətdə deyilir: "Əgər okeanın o biri tərəfindən olsa da belə."(۴)

۴. İshaq ibn Yəzid, Muəmmər ibn Əbi Ziyad və



---

۱- [۱]. Məcalis, Şeyx Tusinin oğlu, səh.۱۷۵.

۲- [۲]. Üsuli Kafi, səh.۶۱۷ (əl-itasu vət-təsmiyət).

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Həmin mənbə.

İbn Riab deyirlər ki, biz imam Sadiqin (ə) yanında oturmuşduq və burada bir kişi asqırdı. Heç kim ona dua etmədi. Həzrət (ə) onun üçün dua etdi və buyurdu: "Subhanəllah niyə dua etmədiniz? Müsəlmanın digər müsəlman qardaşının boynunda olan haqqı belədir: ١. Xəstələnərkən ona baş çəksin. ٢. Onun dəvətini qəbul etsin. ٣. Cənazəsinin dəfnində hazır olsun. ۴. Asqıranda ona dua etsin."(١)

Davud ibn Həsin deyir ki, biz on dörd nəfərlə imam Sadiqin (ə) yanında idik, imam (ə) .۵ asqırdı və heç kim bir söz demədi. İmam (ə) buyurdu: "Niyə dua etmədiniz? Möminin başqa bir möminin boynunda olan haqqı budur ki: ١. O xəstələnərsə ona baş çəksin, ٢. dünyasını dəyişəndə cənazəsinin dəfnində iştirak etsin, ٣. asqıranda ona dua etsin, ۴. onun dəvətini qəbul etsin."(٢)

**Asqıranda dua etmək və cavab verməyin qaydasına aid bölmə .۵٨**

Səd ibn Əbi Xələf deyir ki, imam Baqir (ə) asqırdı və o həzrətə (ə) dedilər: . ١ "Yərhəmukəllah (Allah sənə rəhmət etsin)."

İmam (ə) cavabında buyurdu: "Yəğfirəllahu ləkum və yərhəmukum (Allah sizi bağışlasın və sizə rəhm etsin)."



---

١- [١] . Həmin mənbə.

٢- [٢] . Həmin mənbə.

(Əgər hər kəs onun yanında asqırsaydı buyurardı: "Yərhəmukəllahu Əzzəvəcəll."(۱)

۲. İmam Məhəmməd Baqir (ə) buyurdu: "Əgər kimsə asqırsa gərək "əl-həmdu lillahi la şərikə ləh" (şükr şəriki olmayan Allah üçündür) deyəsiniz. Ona dua edən kəs isə gərək "yərhəmukəllah" (Allah sənə rəhmət etsin) və asqıran şəxs də "yəğfirullahu ləkə və ləna" (Allah səni və bizi bağışlasın) desin. Rəsulullahdan (s) Quran ayəsi, yaxud Allahın adı olan bir şey barəsində sual soruşdular və həzrət (s) də buyurdu: hər hansı bir (şeydə Allahın adı və Allah Əzzəvəcəllin zikri olarsa, bu çox yaxşıdır."(۲)

۳. Şeyx Səduq "Xisal" kitabında həzrət Əlidən (ə) belə nəql etmişdir: "Əgər sizdən kimsə asqırsa onun üçün dua edib "yərhəmukumullah" (Allah sizə rəhmət etsin) və o da "yəğfirullahu ləkum və yərhəmukum" (Allah sizi bağışlasın və sizə rəhmət etsin) desin. Çünki Allah taala buyurmuşdur: Sizə salam verdikdə siz ondan daha gözəl və (yaxud onun kimi bir salam verin."(۳) (۴)

## ۵۹. Qadın asqıranda uşağın onun üçün dua etməsinin caiz olmasına aid bölmə

۱. İmam Həsən Əsgərinin (ə) Nəsim adlı xadimi



---

۱- [۱]. əl-itas) ۶۱۸.Üsuli kafi, səh).

۲- [۲]. Həmin mənbə.

۳- [۳]. Nisa surəsi, ayə ۸۶.

۴- [۴]. Xisal, Səduq ۲-ci cild, səh.۱۶۸.

deyir ki, imam Sahibəzzaman (ə) anadan olandan bir gecə sonra o həzrətin (ə) yanına gəldim və hüzurunda asqırdım. həzrət (ə) buyurdu: "Yərhəmukillah."

Mən onun bu sözündən sevindim. Sonra həzrət (ə) buyurdu: "Sənə asqırmağın təsiri barəsində bəşarət verirəm ki, asqırmaq üç gün ölümdən amanda olmaqdır."(۱)

## ۶۰. Asqırmağın müstəhəbliyi və pis asqırmaqların məkruh olmasına aid bölmə

۱. Əhməd ibn Məhəmməd ibn Əbi Nəsr deyir ki, imam Riza (ə) buyurdu: "Ağzını açmaq və əsnəmək şeytandan, asqırmaq isə Allahdandır. (xeyirlidir)."(۲)

۲. İmam Sadiq (ə) buyurdu: "Asqırmaq bütün bədənə xeyirdir, lakin üç dəfədən çox olmasın. Əgər üç dəfədən çox olarsa, bu xəstəlik əlamətidir."(۳)

۳. Əbu Bəkr həzər deyir ki, imam Sadiqdən (ə) Allah Əzzəvəcəllin buyurduğu "həqiqətən səslərin ən pisi ulaqların səsidir"(۴) ayəsi barəsində soruşdum və həzrət (ə) buyurdu: "Burada məqsəd pis asqırmaqdır."(۵)

۴. Əhli-sünnədən olan bir nəfər imam Sadiqdən (ə) nəql edir ki, həzrət (ə) buyurdu: "hərçənd nütfə kişilik orqanından çıxır,



---

۱- [۱]. Kəmaluddin, səh.۲۴۰.

۲- [۲]. Üsuli Kafi, səh. ۶۱۷.

۳- [۳]. Üsuli Kafi, səh.۶۱۹.

۴- [۴]. Loğman surəsi, ayə ۱۹.

۵- [۵]. Üsuli Kafi, səh.۶۱۹.

asqırmaq da nütfə kimi bütün bədəndən çıxır. Heç görmsən ki, insan asqıranda onun bütün bədən üzvləri hərəkətə gəlsin? Asqıran kəs yeddi gün ölümdən amandadır."(١)

## ۶۱. Üç dəfə ardıcıl asqıranda...aid bölmə

۶۱. ÌÇ DəFə ARDıCıL ASQıRANDA DUANıN TəKRARLANMASıNıN MüSTəHəBLIYINə AID BöLMə

١. İmam Baqir (ə) buyurdu: "Əgər kimsə üç dəfə asqırarsa, ona dua et və əgər bu çox olarsa, dua etmək lazım deyil."(٢)

٢. İmam Cəfər Sadiq (ə) nəql etmişdir ki, həzrət Əli (ə) buyurdu: "Üç dəfə asqıran adam üçün "yərhəmukumullah" de və əgər üç dəfədən artıq olarsa dua etməyə ehtiyac yoxdur."(٣)

٣. O həzrət (ə) digər bir hədisdə isə buyurubdur: "Əgər asqırmaq üç dəfədən çox olarsa, ona "şəfakəllah" (Allah sənə şəfa versin) deyilsin. Çünki, o asqırmaq xəstəliyin nəticəsində baş verir."(۴)

## ۶۲. Asqıranda "əl–həmdu lillah" deməyin müstəhəbliyinə aid bölmə

١. Saleh ibn Əbi Həmmad deyir ki, Məhəmməd Əhli-beytinin (ə) alimi imam Musa Kazımdən (ə)



---

١- [١]. Həmin mənbə.

٢- [٢]. əl-itas) Üsuli Kafi, səh.۶١٩).

٣- [٣]. Xisal, Səduq, səh.۶٣.

۴- [۴]. Həmin mənbə.

asqırmaq və "əl-həmdu lillah" deməyin səbəbi barəsində soruşdum. həzrət (ə) buyurdu: "Bədən üzvlərinin sağlamlığı Allah tərəfindən bəndəsi üçün verilmiş bir nemətdir. Mümkündür bəndə bu neməti unutsun. Buna görə də Allah bədəndə olan havaya əmr edir ki, asqıraq şəklində onun bədənindən çıxsın və bəndə asqıranda Allaha sitayiş etsin. Buna əsasən asqıranda "əl-həmdu lillah" demək insanın unutduğu (nemətə görə şükr etməsidir."(١)

İmam Sadiq (ə) buyurdu: "həddi-buluğa çatmamış bir yeni yetmə peyğəmbərin (s) .٢ yanında asqırdı və "əl-həmdu lillah" dedi. Peyğəmbər (s) isə ona buyurdu: Barəkəllah (fikə-(Allah sənə mübarək etsin)."(٢)

Mismə ibn Əbdül-Məlik deyir ki, imam Sadiq (ə) asqırdı və buyurdu: "Əl-həmdu lillahi .٣ ".rəbbil-aləmin

Daha sonra barmağını burnunun üstünə qoydu və dedi: "Mənim burnum (təvazökarlıqla Allahın müqabilində torpağa dəyibdir."(٣)

İmam Sadiq (ə) buyurdu: "Əgər kimsənin asqırdığını eşitsəniz əvvəlcə ona dua edin .۴ ((yəni "yərhəmukumullah" deyin) və sonra isə onunla danışın."(۴)



---

.(Üsuli Kafi, səh.۶١٧ (əl-itas . [١] -١
.(Üsuli Kafi, səh.۶١٨ və ۶١٩ (əl-itas . [٢] -٢
.Həmin mənbə . [٣] -٣
.Həmin mənbə . [۴] -۴

۵. Əmirəlmöminin (ə) buyurdu: "hər kim asqıranda "əl-həmdu lillahi rəbbil-aləminə əla kulli halin" (bütün halda aləmlərin Pərvərdigarı olan Allaha həmd və sitayiş olsun) desə, qulaq və diş ağrısına giriftar olmayacaq."(۱)

۶. İmam Cəfər Sadiq (ə) Rəsulullahdan (s) nəql edib buyurur: "Əgər müsəlman bir şəxs asqırarsa və canı ağrıdığı dərdə görə sükut edərsə, ("əl-həmdu lillah") deməsə, mələklər onun əvəzində "əl-həmdu lillahi rəbbil-aləmin" deyərlər və əgər özü "əl-həmdu lillahi rəbbil-aləmin" desə, mələklər "yəğfirullahu ləkə" (Allah səni bağışlasın) deyərlər."

həmçinin imam (ə) peyğəmbərdən (s) nəql edir: "Xəstənin asqırması bədənin sağlamlığının və rahatçılığının əlamətidir."(۲)

## ۶۳. Asqıranın, yaxud onu eşidən kəsin...aid bölmə

۶۳. ASQıRANıN, YAXUD ONU eşIDəN KəSIN MəhəMMəDə (S) Və ONUN ƏhLI-BeYTINə (ə) SALAVAT DeMəSININ MüSTəhəBLIYINə AID BöLMə

۱. İbn Əbi Umeyr dostlarından birindən nəql edir ki, bir nəfər imam Baqirin (ə) yanında asqırdı və "əl-həmdu lillahi rəbbil-aləmin" dedi. İmam (ə) ona dua etmədi və buyurdu: "Bizim haqqımızdan azaltdı."

Daha sonra buyurdu: "Sizlərdən kimsə asqırsa



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. əl-itas) Üsuli Kafi, səh.۶۱۹).

".əl-həmdu lillahi rəbbil-aləmin və səlləllahu əla Muhəmmədin və əhli-bəytih" desin"

(həmin şəxs bu duanı oxudu və imam (ə) da ona dua etdi.(۱

İmam Sadiq (ə) buyurdu: "hər kim bir nəfərin asqırmağını eşidəndə "əl-həmdu lillah" .۲ ".deyib və salavat göndərsə, o heç vaxt göz ağrısına və diş ağrısına giriftar olmaz

Daha sonra buyurdu: "Əgər sən bir nəfərin asqırmağını eşitsən, bu duanı oxu və (hərçənd həmin şəxslə sənin aranda bir dərya qədər fasilə varsa da belə."(۲

Cabir deyir ki, imam Baqir (ə) buyurdu: "Asqırmaq yaxşıdır, cismə faydası vardır və .۳ ".insana Allah-taalanı xatırladır

İmama (ə) dedim ki, bizim yanımızda olan adamlardan bir hissəsi deyirlər: "Asqırmağın ".duasında peyğəmbər (s) üçün heç bir şey yoxdur

İmam (ə) buyurdu: "Əgər yalan desələr, Məhəmmədin (ə) şəfaəti onlara (çatmayacaq."(۳

İmam Sadiq (ə) buyurdu: "hər kim asqıranda əlini burnunun ucuna qoyub "əl-həmdu .۴ lillahi rəbbil-aləmin, həmdən kəsirən kəma huvə əhluh, və səlləllahu əla Muhəmmədin-nəbiyyi və alihi və



---

.(Üsuli Kafi, səh.۶۱۸ və ۶۱۹ (əl-itas . [۱] -۱

.Həmin mənbə . [۲] -۲

.Həmin mənbə . [۳] -۳

səlləm" (həmd və sitayiş aləmlərin Pərvərdigarı olan Allaha layiqdir, Allahın peyğəmbərinə (s) və onun Əhli-beytinə (ə) salam olsun) desə, onun burnundan kiçik (bir quş çıxıb göylərə qədər uçar və qiyamətə kimi onun üçün məğfirət diləyər."(١)

### Asqıranda, heyvanın başını kəsəndə və...aid bölmə .۶۴

ASQıRANDA, heYVANıN BAşıNı KəSəNDə Və CINSI əLAQəDə OLANDA . ۶۴ MəhəMMəDə (S) Və ONUN ƏhLI-BeYTINə (ə) SALAVAT DeMəK MəKRUh DeYIL, əKSINə MüSTəhəBDIR

Fuzeyl ibn Yəsar deyir ki, imam Məhəmməd Baqirə (ə) ərz etdim: "Camaat üç şeydə .١ Məhəmmədə (s) və onun Əhli-beytinə (ə) salavat deməyi bəyənmirlər: ١. Asqıranda. ٢. heyvanların başını kəsəndə. ٣. Cinsi əlaqədə olanda."

İmam (ə) buyurdu: "Onlara nə olub? Vay olsun onlara, münafiq olublar, onlara Allahın (lənəti olsun!"(٢

Uyunu əxbarir-Riza" kitabında nəql olunubdur ki, imam Riza (ə) Məmuna yazdığı" .٢ məktubunda buyurdu: "hər yerdə peyğəmbərə (s) salavat göndərmək lazımdır. O (cümlədən asqıranda, heyvanların başını kəsəndə və sair."(٣

### Kafir) zimmi şəxs asqıranda ona və...aid bölmə) .۶۵

KAFIR) ZIMMI şəXS ASQıRANDA ONA Və ONUN hIDAYəTI üçüN DUA eTMəYIN) .۶۵ CAIZ OLMASıNA AID BöLMə

,İbn Əbi Nəcran bəzi dostlarından nəql edir ki .١



---

.Həmin mənbə . [١] -١

.Həmin mənbə . [٢] -٢

.Uyunu əxbarir-Riza, səh.٢٧۶ . [٣] -٣

xaçpərəst bir kişi imam Sadiqin (ə) yanında asqırdı. Camaat ona dedilər: "hədakəllah" .((Allah səni hidayət etsin

.(İmam (ə) buyurdu: "Yərhəmukəllah" (Allah səni bağışlasın

".həzrətin (ə) əshabı dedilər: "O xaçpərəstdir

(İmam (ə) cavab verdi: "Allah onu bağışlamamış hidayət etməz."(١

## Əgər danışmaq asqırmaqla birlikdədirsə...aid bölmə .۶۶

ƏGəR DANışMAQ ASQıRMAQLA BIRLIKDəDIRSə, BUNU DANışANıN SöZüNüN . ۶۶ DOğRU OLMASıNA DəLIL BILMəK CAIZ OLUR

İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurmuşdur: "Asqırmaq danışanın . ١ (sözünün doğru olmasına dəlildir."(٢

Həmçinin o həzrət (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Əgər bir nəfər . ٢ danışanda başqa bir nəfər asqırarsa, bu onun sözünün doğru olması üçün (sübutdur."(٣

## Qoca möminə ehtiram etməyin müstəhəbliyinə aid bölmə .۶۷

Abdulla ibn Sənan deyir ki, imam Cəfər Sadiq (ə) buyurdu: "Qoca kişiyə ehtiram . ١ (etmək Allah-taalaya ehtiramdır."(۴



---

.(Üsuli Kafi, səh.۶١٨ (əl-itas . [١] -١

.Həmin mənbə . [٢] -٢

.Həmin mənbə . [٣] -٣

.(Üsuli Kafi, səh.۶١٩ (vucubu iclali ziş-şəybətil-muslim . [۴] -۴

۲. İmam Sadiq (ə) buyurdu: "Qocalıq nəticəsində başının tükünü ağartmış kişiyə ehtiram etmək, Allah-taalaya ehtiram göstərməyin əlamətlərindəndir."(۱)

۳. İmam Cəfər Sadiq (ə) buyurdu: "Bizim böyüyümüzə ehtiram və kiçiyimizə rəhm etməyən kimsə bizdən deyil."(۲)

İmam Sadiq (ə) buyurdu: "Qocalıq nəticəsində başının tükünü ağartmış mömin bir kişiyə ehtiram etmək Allah-taalaya ehtiram etməyin əlamətlərindəndir. hər kəs mominə ehtiram edərsə, Allaha ehtiram etmişdir və hər kəs qoca mominə hörmətsizlik edərsə, Allah ölümündən qabaq hörmətsizlik etmək üçün ona tərəf bir nəfəri göndərər."(۳)

۵. İmam Sadiq (ə) buyurdu: "Üç nəfərin haqqı nifaq əhli kimi tanınmış münafiqdən (nifaqı son dərəcəyə çatmış olan) başqa heç kəs tərəfdən tanınmamış qalmaz. ۱. Saçlarını İslam dini yolunda ağartmış şəxs. ۲. Quran hafizi (Quranı əzbərdən bilən). ۳. Ədalətli rəhbər."(۴)

۶. İmam Sadiq (ə) buyurdu: "Öz böyüklərinizə (ağsaqqallarınıza) ehtiram edin və onlara baş çəkin."(۵)

۷. Buna oxşar sənədlə o həzrətdən (ə) başqa bir hədis də nəql olunub və orada əlavə edilibdir: "Ən

səh:۱۰۴

---

۱- [۱] . Həmin mənbə.

۲- [۲] . babu iclalil-kəbir (Üsuli Kafi, səh.۳۱۹).

۳- [۳] . vucubu iclali ziş-şəybətil-muslim (Üsuli Kafi, səh.۶۲۰).

۴- [۴] . Həmin mənbə.

۵- [۵] . babu iclalil-kəbir (Üsuli Kafi, səh.۳۱۹).

yaxşı sileyi-rəhm yaxınlara əziyyət verməkdən pərhiz etməkdir."(۱)

۸. İmam Sadiq (ə) Rəsulullahdan (s) nəql edib buyurur: "Qoca müsəlmana ehtiram etmək, Allaha ehtiramdır."(۲)

۹. İmam Sadiq (ə) peyğəmbərdən (s) nəql edib buyurmuşdur: "hər kim yaşı ötmüş şəxsə qocalığına görə ehtiram edərsə, Allah onu qiyamət gününün vəhşəti və qorxusundan amanda saxlayacaq."(۳)

۱۰. O həzrət (ə) buyurubdur: "hər kim İslam dini yolunda saçlarını ağartmış qocaya ehtiram edərsə, Allah onu qiyamət gününün vəhşətindən amanda saxlayar."(۴)

۱۱. Peyğəmbər (s) buyurdu: "Qoca şəxsin fəzilətini tanıyıb ona ehtiram edəni Allah qiyamət gününün vəhşətindən qoruyar."

həzrət (s) buyurdu: "Mömin qoca kişiyə ehtiram etmək Allaha ehtiramdır." (۵)

۱۲. İmam Sadiq (ə) buyurdu: "İnsanların fəzilətini tanımayan kəs öz düşüncəsi qədər məğrur olar."(۶)

۱۳. Rəsulullah (s) buyurdu: "Qocalara ehtiram edin. Çünki yaşlı adamlara ehtiram göstərmək Allaha ehtiramdır."(۷)



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. iclalul-kəbir (Üsuli Kafi, səh.۳۹۱).

۳- [۳]. vucubu iclali ziş-şəybətil-muslim (Üsuli Kafi, səh.۶۱۹).

۴- [۴]. Həmin mənbə.

۵- [۵]. Səvabul-əmal, səh.۱۰۲.

۶- [۶]. Məaniyul-əxbar, səh.۷۲.

۷- [۷]. Məcalis, Şeyx Tusinin oğlu, səh.۱۹۶.

## Kəramətli və şərafətli insana ehtiram etməyin müstəhəbliyinə aid bölmə .۶۸

Həccal deyir ki, Cəmil ibn Dərracdan sual soruşdum: "Bu doğrudur ki, Rəsulullah (s) .۱ "?buyurubdur: Bir qövmün şərəfli şəxsi sizin yanınıza gələndə ona ehtiram edin

."Dedi: "Bəli

"?Soruşdum ki, "Şərəfli şəxs kimdir

O dedi: "İmam Sadiqdən (ə) bu barədə soruşanda imam (ə) buyurdu: Şərif şəxs var- ".dövlət sahibidir

"?İmamdan (ə) soruşdum: "həsəb nədir

həzrət (ə) buyurdu: "Var-dövlət və bundan qeyrilərinin vasitəsi ilə yaxşı işlər edən ".adama deyilir

"?Mən soruşdum: "Kərəm nədir

(həzrət (ə) buyurdu: "Pərhizkarlıq."(۱

İmam Sadiq (ə) peyğəmbərdən (s) nəql edib buyurdu: "Səxavətli bir şəxs sizin . ۲ (yanınıza gələndə ona ehtiram edin."(۲

İmam Cəfər Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Əgər bir qövmün . ۳ (səxavətli adamı sizin yanınıza gələrsə, ona ehtiram edin."(۳

Abdulla Ələvi cəddindən nəql etmişdir ki, Əmirəlmöminin (ə) buyurdu: "hatəm . ۴ Tayinin oğlu Ədi Rəsulullahın (s) xidmətinə gələndə



---

.Rövzeyi Kafi, səh.۲۱۹ . [۱] -۱

.(Üsuli Kafi, səh.۶۲۰ (babu ikramil-kərim . [۲] -۲

.Həmin mənbə . [۳] -۳

peyğəmbər (s) onu evinə apardı, evindəki dəridən olan balışı onun üçün gətirdi və (Ədini onun üstündə oturtdu."(١)

## Mütəkkə və ətir kimi hörmət və...aid bölmə .۶۹

MüTəKKə Və əTIR KIMI höRMəT Və ehTIRAMı DA QəBUL eTMəMəYIN . ۶۹ MəKRUhLUğUNA AID BöLMə

İmam Sadiq (ə) nəql edir ki, iki nəfər həzrət Əlinin (ə) hüzuruna gəldilər. həzrət (ə) .١ onların hər biri üçün döşəkçə verdi. Onlardan biri onun üstündə oturdu, digəri isə bundan imtina etdi. həzrət (ə) ona buyurdu: "Bunun üstündə otur. Çünki ulağdan (başqa heç kəs ehtiramı qəbul etməkdən imtina etməz."(٢)

Əbul-Həsən imam Musa Kazım (ə) nəql edir ki, Əmirəlmöminin (ə) buyurardı: . ٢ "."Ulağdan başqa heç kəs ehtiramı qəbul etməkdən imtina etməz

həzrətdən (ə) soruşdum ki, ehtiramdan məqsəd nədir? həzrət (ə) buyurdu: "Bir şəxsə (məclisdə yer vermək və ona təklif olunan ətir."(٣)

Əli ibn Cəhm deyir ki, Əbul-Həsən imam Kazım (ə) buyurdu: "Ulağdan savayı heç kim .٣ ".ehtiramı qəbul etməkdən çəkinməz

"?həzrətdən (ə) soruşdum: "Burada ehtiramdan məqsəd nədir

O buyurdu: "Ətir kimi şey və insana hər hansı



---

.Həmin mənbə . [١] -١

.(Üsuli Kafi, səh.۶٢٠ (babu ikramiz-zəyf . [٢] -٢

.Məaniyul-əxbar, səh.٧٨; Uyunul-əxbar, səh.١٧٣ . [٣] -٣

(bir şeylə edilən ehtiram."(۱

Əbu Zeyd Məkki deyir ki, imam Musa Kazım (ə) buyurdu: "Ulağdan savayı heç kim .۴ ".ehtiramdan imtina etməz

(Burada imamın (ə) ondan məqsədi ətir və mütəkkədir.(۲

Bəzənti Əbül-Həsən Əli ibn Musa ər-Rizadan (ə) nəql edir ki, həzrət Əli (ə) buyurdu: .۵ "."Ulağdan savayı heç kim ehtiramı qəbul etməkdən imtina etməz

"?İmam Rizadan (ə) soruşdum: "Məqsədiniz nədir

həzrət (ə) buyurdu: "Bu ehtiram ətirə və məclisdə yer göstərməyə aiddir. hər kim bu (iki şeyi qəbul etməsə yuxarıda deyildiyi kimidir."(۳

Səmaə ibn Mehran deyir ki, imam Sadiqdən (ə) soruşdum: "Əgər hər kim ona təklif .۶ "?olunan ətiri qaytarsa, o nə sayılır

(həzrət (ə) buyurdu: "Yaxşılıq və ehtiramı qəbul etməmək yaxşı deyil."(۴

Qurbul-əsnad" kitabında həzrət Əlidən (ə) nəql olunur ki, Rəsulullah (s) buyurdu:" .۷ "Əgər sizə hörmət göstərsələr, siz onu geri qaytarmayın. Çünki hörməti ulağ qəbul (etməz."(۵



---

.Həmin mənbə . [۱] -۱

.Məaniyul-əxbar, səh.۴۷۸; Uyunul-əxbar, səh.۱۷۳ . [۲] -۲

.Məaniyul-əxbar, səh.۵۲ . [۳] -۳

.Məaniyul-əxbar, səh.۷۸ . [۴] -۴

.Qurbul-əsnad, səh.۴۴ . [۵] -۵

## ۷۰. QONAğı QARşıLAMAğıN, YOLA SALMAğıN Və ONUN eV SAhIBINə ITAəT eTMəSININ MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Sadiq (ə) peyğəmbərdən (s) nəql edib buyurur: "Qonağın ev sahibinin boynunda olan haqqından biri də budur ki, ev sahibi sakit və vüqarlı halda qonaqla birlikdə evə daxil olanda və evdən çıxanda onunla bir neçə addım getsin."

O həzrət (ə) yenə də Rəsulullahdan (s) nəql edib buyurmuşdur: "Hər kim müsəlman qardaşının evinə daxil olarsa, oradan çıxana qədər ev sahibi ona göstəriş versin."(۱)

## ۷۱. DOSTUN YAXşıLığıNA DANışMAQ Və YAXUD hARAM əMəLə şAhIDLIK eTMəKDəN SAVAYı hALDA ONUN əMANəT eTDIYI SIRRI ICAZəSI OLMADAN AçMAQ CAIZ DeYIL

۱. İmam Baqir (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Məclislər əmanətdir (yəni məclisdə deyilən söz əmanət hökmündədir və gərək başqalarına deyilməsin)."(۲)

۲. İbn Əbi Ovf deyir ki, imam Sadiq (ə) buyurdu: "Məclislər əmanətdir."(۳)

۳. İmam Cəfər Sadiq (ə) buyurdu: "Kimsənin gizli qalmaq istədiyi sözünün icazəsi olmadan, ya etibarlı adamdan başqa və ya da onun yaxşılığını yad



---

۱-[۱]. babu həqqid-daxil) Üsuli Kafi, səh.۶۲۰).

۲-[۲]. babul-məcalis bil-əmanəti) Üsuli Kafi, səh.۶۲۰).

۳-[۳]. Həmin mənbə.

(etməkdən savayı digər bir yerdə deyilməsi caiz deyil."(۱

۴. Cabir ibn Abdulla Ənsari deyir ki, Rəsulullah (s) buyurdu: "Üç məclisdən başqa məclislər əmanət hesab olunur: ۱. Nahaq qan tökülmüş məclis; ۲. Zina etdikləri yer; ۳. haram malın haqsız yerə halal olunduğu məclis."(۲)

۷۲. ƏGəR üç NəFəR BIRLIKDə OLSALAR, ONLARDAN IKISININ BIR-BIRININ QULAĞıNA PıçıLDAMASıNıN MəKRUhLUğUNA AID BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "Əgər üç nəfər birlikdə olsalar, onlardan ikisi gərək bir-birinin qulaqlarına pıçıldayıb söhbət etməsinlər. Çünki bu əməl üçüncü nəfəri qəmgin edir və incidir."(۳)

۲. İmam Kazım (ə) buyurdu: "Əgər üç nəfər bir evdə olarlarsa, onlardan iki nəfəri gərək pıçıldaşıb bir-birlərinin qulaqlarına söz deməsinlər. Çünki bu əməl onların dostlarını qəmgin edər."(۴)

۷۳. MüSəLMANıN SöZüNü KəSMəYIN MəKRUhLUğUNA AID BöLMə

۱. İmam Cəfər Sadiq (ə) peyğəmbərdən (s) nəql edib buyurmuşdur: "Müsəlman qardaşının sözünü kəsən şəxs onun üzünü didmiş kimidir."(۵)



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. Məcalis, Şeyx Tusinin oğlu, səh.۳۳.

۳- [۳]. Üsuli Kafi (babul-munacat).

۴- [۴]. Həmin mənbə.

۵- [۵]. Üsuli Kafi, səh.۶۲۱.

## OTURMAQ QAYDASıNıN MüSTəhəBLIYI, YA DA MəKRUhLUğUNA AID BöLMə .۷۴

۱. Əbdül-Əzim ibn Abdulla Ələvi (ravisi bilinməyən bir hədisdə) deyir: "Peyğəmbərin (s) üç növ oturmaq qaydası vardı: ۱. Dizlərini qucaqlayan halda oturardı; ۲. Dizi üstə oturardı; ۳. Bir ayağını əyib o biri ayaqını da onun üstünə qoyardı və o həzrəti (ə) heç vaxt dizlərini büküb oturan görmədilər."(۱)

۲. Əbu həmzə Sumali deyir ki, Əli ibn Hüseyni (ə) oturub bir ayağını o biri ayağının üstünə qoymuş halda gördüm və ərz etdim: "Camaat (sonrakı hədisə istinad edərək yəhudi qövmü) belə oturmağı bəyənmirlər və deyirlər ki, bu Allahın oturuşuğu kimidir."

İmam (ə) buyurdu: "Mənim belə oturmağım yorulduğum üçündür, halbuki Allah yorulmur, mürgüləmir və yuxuya getmir."(۲)

۳. həmmad ibn Osman deyir ki, imam Sadiq (ə) bir ayağını o biri ayağının üstünə aşırmış halda oturmuşdu. Bir nəfər ərz etdi: "Sənə fəda olum! Belə oturmaq məkruhdur."

İmam (ə) buyurdu: "Yox, bu yəhudilərin sözüdür. Onlar deyirlər: Allah yeri və göyləri yaratdıqdan sonra ərşə qalxdı və istirahət etmək üçün belə oturdu. Sonra isə Allah bu ayəni nazil etdi: Tək olan Allahdır ki, ondan başqa bir məbud yoxdur. Öz zatı ilə var



---

۱- [۱]. babul-culus) Üsuli Kafi, səh.۶۲۱).

۲- [۲]. Həmin mənbə.

olan diri və varlıq aləmini bərqərar saxlayan qadir və əbədidir. Onu əsla nə mürgü (tutar, nə də yuxu."(١

(İmam Sadiq (ə) elə oturduğu kimi də qaldı.(٢

Məkarimul-əxlaq" kitabında deyilir ki, Rəsulullah (s) oturanda ayaqlarını yerə qoyub" .۴ (düz tutardı və dizlərini iki əliylə qucaqlayardı (yəni dizlərini qucaqlayıb oturardı).(٣

MəCLISDə TəVAZöKARLığA GöRə öZ şəNINDəN AşAğıDA OTURMAğıN . ٧۵ MüSTəhəBLIYINə AID BöLMə

İmam Sadiq (ə) buyurdu: "Məclisdə aşağıda oturmağa razı olan kəs yerindən . ١ (qalxana qədər mələklər ona salam göndərər."(۴

İmam Cəfər Sadiq (ə) buyurdu: "Əgər peyğəmbər (s) bir mənzilə daxil olsaydı, . ٢ (məclisdə aşağıda oturardı."(۵

İmam Sadiq (ə) buyurdu: "Təvazökarlığın əlaməti budur ki, insan öz şənindən . ٣ (aşağıda otursun."(۶

İmam Sadiq (ə) buyurdu: "Təvazökarlığın əlaməti belədir: ١. Məclisdə aşağı yerdə .۴ oturmağa razı olasan; ٢. Görüşdüyün adama salam verəsən; ٣. haqq səninlə olsa da belə mübahisəni dayandırasan; ۴. Səndə olan



---

.Bəqərə surəsi, ayə ٢۵۵ . [١] -١

.(Üsuli Kafi, səh.۶٢١ (babul-culus . [٢] -٢

.Məkarimul-əxlaq, səh.١۵ . [٣] -٣

.(Üsuli Kafi, səh.۶٢١ (babul-culus . [۴] -۴

.Həmin mənbə . [۵] -۵

.(Üsuli Kafi, səh.٣۶٩ (babut-təvazu . [۶] -۶

(təqvaya görə səni təriflməyi sevməyəsən."(۱

۵. İbn Abbas deyir: "Rəsulullah (s) yerdə oturardı, yerdə yemək yeyərdi, öz əliylə qoyunları bağlayardı və arpa çörəyi üçün də olsa belə qulların dəvətini qəbul edərdi."(۲)

۶. Məsəb ibn Şeybə deyir ki, peyğəmbər (s) buyurdu: "Bir dəstə adam məclisdə oturarlarsa, kimsə içəri daxil olanda əgər ona yer verərlərsə gərək o bunu qəbul etsin. Çünki bu vasitə ilə ona ehtiram edirlər və əgər ona yer verməsələr harada yer boş olsa orada otursun."(۳)

۷۶. ÌZü QIBLəYə OTURMAğıN MüSTəhəBLIYINə AID BöLMə

۱. həmmad ibn Osman deyir: "İmam Sadiqi (ə) evində üzü qibləyə oturan görərdim."(۴)

۲. İmam Sadiq (ə) buyurdu: "Peyğəmbər (s) çox vaxt üzü qibləyə oturardı."(۵)

۳. Şeyx Bəhayi "Miftahul-fəlah" kitabında deyir ki, məsum imamlardan (ə) belə rəvayət olunubdur: "Oturmağın ən yaxşısı üzü qibləyə tərəfdir."(۶)

۷۷. GüNəşLə üZBəüZ OTURMAğıN MəKRUhLUğUNA AID BöLMə

۱. Səhl ibn Ziyad sənədi həzrət Əliyə (ə) çatan bir



---

۱- [۱] . Həmin mənbə.

۲- [۲] . Məcalis, Şeyx Tusinin oğlu, səh.۲۵.

۳- [۳] . Həmin mənbə.

۴- [۴] . babul-culus) Üsuli Kafi, səh.۶۲۱).

۵- [۵] . Həmin mənbə.

۶- [۶] . Miftahul-fəlah, səh.۱۳.

hədisdə o həzrətdən (ə) nəql edir: "Günəşlə üzbəüz oturmayın. Çünki, o, od kürəsidir və insanın rənginin solmasına, paltarın köhnəlməsinə, gizli ağrıların aşkar olmasına (bais olur."(۱)

İmam Musa Kazım (ə) nəql edir ki, Rəsulullah (s) buyurubdur: "Günəşdə dörd . ۲ xüsusiyyət vardır: ۱. Rəngi dəyişdirir; ۲. Yeli üfunətləndirir; ۳. Paltarı köhnəldir; ۴. (Bədəndə ağrı yaradır."(۲)

həzrət Əli (ə) "Ərbəə miə" hədisində buyurubdur: "Arxası günəşə tərəf oturun. Çünki .۳ (gizlin ağrıları aşkara çıxardır."(۳)

ÖZGə eVINDə eV SAhIBININ GöSTəRDIYI YeRDə OTURMAğıN MüSTəhəBLIYINə .۷۸ AID BöLMə

İmam Sadiq (ə) atası imam Baqirdən (ə) nəql edib buyurubdur: "Əgər hər kəs mömin .۱ qardaşının evinə daxil olarsa, ev sahibi harada yer versə orada otursun. Çünki ev (sahibi evə məhrəmdir və daha yaxşı tanıyandır."(۴)

İKI AYAğı üZəRINDə OTURUB DIZLəRI QUCAQLAMAğıN MüSTəhəBLIYINə AID .۷۹ BöLMə

Əbul-Həsən imam Kazım (ə) Rəsulullahdan (s) nəql edib buyurmuşdur: "Ayaq üstə .۱ oturub dizləri



---

.Xisal, Səduq ۱-ci cild, səh.۴۸ . [۱]-۱
.Xisal, Səduq ۱-ci cild, səh.۱۱۷ . [۲]-۲
.Xisal, Səduq ۲-ci cild, səh.۱۵۹ . [۳]-۳
.Qurbul-əsnad, səh.۳۳ . [۴]-۴

(qucaqlamaq ərəblərin divarı kimidir."(١)

Səmaə deyir ki, imam Sadiqdən (ə) özünü bir paltarla örtən bir nəfər kişinin .٢ barəsində soruşdum. İmam (ə) buyurdu: "Əgər paltar onun övrətini örtərsə iradı (yoxdur."(٢)

ZARAFATıN Və AZ GüLMəYIN MüSTəhəBLIYINə AID BöLMə .٨٠

Muəmmər ibn Xəllad deyir ki, Əbül-Həsən imam Kazıma (ə) ərz etdim: "Sənə fəda .١ ".olum! Bir dəstə adam birlikdə zarafat edib və gülürlər

".İmam (ə) buyurdu: "Əgər bir şey yoxdursa eyb etməz

Mən başa düşdüm ki, imamın (ə) məqsədi budur ki, əgər o zarafatda söyüş və hərzə danışıq olmasa iradı yoxdur. həzrət (ə) daha sonra buyurdu: "Səhrada yaşayan bir ərəb peyğəmbərə (s) hədiyyə gətirdi və peyğəmbərə (s) ərz etdi: Mənim hədiyyəmin .pulunu verin

Rəsulullah (s) güldü və həmişə qəmgin olanda onu yadına salıb buyurardı: O necə (oldu? Ey kaş bizim yanımıza gələrdi!"(٣)

Birinci Əbul-Həsən imam Musa Kazım (ə) buyurdu: "Yəhya ibn Zəkəriyya ağlayardı .٢ və gülməzdi. Amma İsa ibn Məryəm ağlayardı və gülərdi, həzrət İsanın (ə) əməli (həzrət Yəhyanın (ə



---

.(Üsuli Kafi, səh.۶٢٢ (babul-itkau vəl-ihtiba . [١] -١

.Həmin mənbə . [٢] -٢

.(Üsuli Kafi, səh.۶٢٢ (babud-duabəti vəz-zəhki . [٣] -٣

(əməlindən daha yaxşı idi."(١)

Fəzl ibn Əbi Qurrə deyir ki, imam Sadiq (ə) buyurdu: "hər hansı bir mömində "duabə" .٣ ".vardır

"?Soruşdum: "Duabə nədir

(həzrət (ə) buyurdu: "Zarafat."(٢)

Yunis ibn Şəybani deyir ki, imam Sadiqdən (ə) soruşdum: "Siz möminlərin bir- .۴ "?birlərinin arasında olan zarafatları necədir

".Ərz etdim: "Azdır

həzrət (ə) buyurdu: "Zarafatı tərgitməyin. Çünki zarafat yaxşı əxlaqın əlamətidir. Bu vasitə ilə qardaşını şad et. Peyğəmbər (s) camaatla zarafat edərdi və onları (sevindirərdi."(٣)

Abdulla ibn Məhəmməd Cufi deyir ki, imam Sadiq (ə) buyurdu: "Camaat arasında .۵ (söyüşsüz zarafat edəni Allah sevir."(۴)

həmran ibn Əyun deyir ki, imam Məhəmməd Baqirin (ə) xidmətinə gəlib ərz etdim: .۶ "."Mənə nəsihət verin

İmam (ə) buyurdu: "Sənə İlahi təqvanı tövsiyə edirəm, zarafatdan pərhiz et. Çünki o (insanın ehtiram və həyasını aradan aparır."(۵)

İmam Cəfər Sadiq (ə) öz atalarından nəql edir ki, peyğəmbər (s) imam Əliyə (ə) olan .٧ vəsiyyətində



---

.Həmin mənbə . [١] -١

.Həmin mənbə . [٢] -٢

.Həmin mənbə . [٣] -٣

.Həmin mənbə . [۴] -۴

buyurdu: "Ya Əli zarafat etmə! Çünki o sənin həyanı aparar, yalan danışma ki, nuraniliyini də səndən alar." (Mərhum Əllamə buyurur ki, burada bu hədisdən məqsəd (çox zarafat etməkdir).(۱)

۸۱. QəhQəhə ILə GüLMəYIN MəKRUhLUğUNA Və TəBəSSüM eTMəYIN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "Qəhqəhə ilə gülmək şeytandandır."(۲)

۲. İmam Məhəmməd Baqir (ə) buyurdu: "Əgər qəhqəhə çəksən bundan sonra de: Pərvərdigara! Məni düşmən bilmə."(۳)

۳. İmam Sadiq (ə) buyurdu: "Möminin gülüşü təbəssümdür."(۴)

۸۲. SəBəBSIZ GüLMəYIN MəKRUhLUğUNA AID BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "Səbəbsiz gülmək nadanlıq əlamətidir."

Sonra buyurdu: "Güləndə gərək qabaq dişlər görsənməsin. Əgər belə olarsa, bəyənilməz iş görmüsən. Pis əməli edən kəs gecə basqınından amanda qalmaz."(۵)

۲. İmam Cəfər Sadiq (ə) buyurdu: "Nə çox insanlar vardır yersiz gülər və qiyamət günü onlar



---

۱- [۱]. "Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۳۳۴.

۲- [۲]. Üsuli Kafi, səh.۲۲۳ (babud-duabəti vəz-zəhki).

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Həmin mənbə.

۵- [۵]. Üsuli Kafi, səh.۶۲۲ (babud-duabəti vəz-zəhki).

çox ağlayarlar, nə çox insanlar vardır Allah qorxusundan çox ağlayarlar və qiyamət günü onlar cənnətdə çox gülərüz və çox şad olarlar."(۱)

۳. İmam Sadiq (ə) buyurdu: "Üç şey Allahı çox pis qəzəbləndirər: ۱. Gecə oyanmadan yatmaq; ۲. Səbəbsiz gülmək; ۳. Doyduqdan sonra yemək."(۲)

۴. İmam Sadiq (ə) buyurdu: "Mədinə şəhərində avara bir kişi camaatı güldürərdi və deyərdi ki, Əli ibn Hüseyn (ə) məni yordu. Çünki hələ onu güldürə bilməmişəm."

Həmin hədisdə gəlibdir ki, imam Zeynəlabidin (ə) buyurdu: "Ona deyin, şübhəsiz, Allahın təyin etdiyi bir gün vardır və o gündə (qiyamət günündə) bekarlar (avaralar) ziyandadırlar." (۳)

۸۳. ÇOX GüLMəYIN Və ZARAFATıN MəKRUhLUğUNA AID BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "Zarafatdan pərhiz edin. Çünki insanın abır-həyasını aparır."(۴)

۲. İmam Cəfər Sadiq (ə) buyurdu: "Çox gülmək qəlbi öldürür."

həmçinin buyurub: "Çox gülmək suyun duzu həll edib əritdiyi kimi dini əridir." (۵)



---

۱- [۱]. Uyunu əxbarir-Riza, səh.۱۷۹.

۲- [۲]. Xisal, Səduq ۱-ci cild, səh.۴۴.

۳- [۳]. Məcalis, Səduq səh.۱۳۲ (۳۹-cu məclis).

۴- [۴]. Üsuli Kafi, səh.۶۲۳ (babud-diabəti vəz-zəhki).

۵- [۵]. Həmin mənbə.

۳. İmam Sadiq (ə) buyurdu: "Çox sevdiyin kəslə zarafat və mübahisə etmə."(۱)

۴. Ənbəsə Abid deyir ki, imam Sadiq (ə) buyurdu: "Çox gülmək abır-həyanı aparır."(۲)

۵. Ənbəsə həmçinin dedi ki, o həzrət (ə) buyurdu: "Zarafat balaca söyüşdür."(۳)

۶. İmam Sadiq (ə) buyurdu: "Mübahisə etmə. Çünki sənin abır-həyan gedər, zarafat etmə ki, sənə qarşı ədəbsiz olarlar."(۴)

۷. İmam Baqir (ə) buyurdu: "Çox zarafat etmək abır-həyanı aparır və çox gülmək imanı bir tərəfə tullayır (aradan aparır)."(۵)

۸. Əbul-Həsən imam Musa Kazım (ə) övladlarından bəzisinə etdiyi vəsiyyətində buyurdu: "Zarafatdan pərhiz edin. Çünki imanın nurunu səndən alar, sənin mürüvvət və kişiliyini yüngülləşdirər."(۶)

۹. İmam Sadiq (ə) nəql edir ki, Əmirəlmöminin (ə) buyurdu: "Zarafatdan pərhiz et. Çünki zarafat düşmənçiliyə, kinə səbəb olur və balaca söyüşdür."(۷)

۱۰. İmam Cəfər Sadiq (ə) buyurdu: "Zarafatdan pərhiz et. Çünki insanların abır-həyasını, əzəmətini aradan aparır."(۸)



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. (babud-diabəti vəz-zəhki (Üsuli Kafi, səh.۶۳۲).

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Həmin mənbə.

۵- [۵]. Həmin mənbə.

۶- [۶]. Həmin mənbə.

۷- [۷]. Həmin mənbə.

۸- [۸]. Həmin mənbə.

۱۱. İmam Sadiq (ə) buyurdu: "Zarafat etmə, sənə qarşı ədəbsiz olarlar."(۱)

۱۲. İmam Cəfər Sadiq (ə) atalarından nəql edir ki, peyğəmbər (s) buyurdu: "Çox zarafat etmək abır-həyanı aparır, çox gülmək imanı nabüd edir və çox yalan danışmaq iman nurun aradan aparır."(۲)

۱۳. İmam Sadiq (ə) atalarından nəql edir ki, həzrət Əli (ə) buyurubdur: "Peyğəmbərin (s) gülüşü təbəssüm idi. Bir gün o həzrət (s) ənsardan olan bir dəstə adamın yanından keçirdi gördü ki, onlar bir-birləri ilə söhbət edirlər və onların ağızlarında çox gülüş vardır. həzrət (s) buyurdu: Ey müsəlmanlar dayanın! Əgər bir kəsi arzusu məğrur etsə və onu xeyir əməldən saxlasa qəbristanlığa baş çəksin, qiyamət gününü və ölümü xatırlasın. Çünki ölüm ləzzətləri dağıdandır."(۳)

۱۴. Abdulla ibn Cofi deyir ki, imam Baqir (ə) buyurdu: "Allah camaat içində zarafat edəni bir şərtlə ki, zarafat söyüşlə nəticələnməsin və təklikdə fikirləşəni, xəlvətdə öyüd-nəsihət alanı və namaz qılmağıyla iftixar edəni çox sevir."(۴)

۱۵. İmam Sadiq (ə) atasından nəql edir ki, həzrət Davud (ə) Süleymana (ə) dedi: "Oğlum! Çox gülməkdən çəkin. Çünki çox gülmək qiyamət günü insanı yoxsul edər."(۵)



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. Məcalis, Səduq səh.۱۶۳ (۴۶-cı məclis).

۳- [۳]. Məcalis, Şeyx Tusinin oğlu, səh.۳۳۲.

۴- [۴]. Məhasin Bərqi, səh.۲۹۳.

۵- [۵]. Qurbul-əsnad, səh.۳۳.

۱۶. Seyid Rəzi "Nəhcül-bəlağə" kitabında nəql edir ki, Əmirəlmöminin (ə) buyurdu: "İnsan zarafat edəndə onun ağlından azalır."(۱)

۸۴. MöMININ üZüNDə TəBəSSüMüN OLMASıNA AID BöLMə

۱. əl-İxvan" kitabında Həzrət Rizadan (ə) nəql olunub: "hər kim öz üzünə gülab vurub" ehtiyacına görə evdən çıxarsa, yoxsulluqla və xarlıqla giriftar olmaz. hər kim təvazökarlıq məqsədilə mömin qardaşının içdiyi suyun artığını içərsə, Allah onu cənnətə daxil edər, Allah mömin qardaşının üzünə təbəssüm edən kəsə savab yazar və savab yazdığı kəsə əzab verməz."(۲)

۲. İmam Baqir (ə) buyurdu: "Möminin qardaşının üzünə təbəssüm etməsi, möminin üzündən toz-torpağı təmizləmək savabdır və mömini sevindirmək kimi heç bir ibadət yoxdur."(۳)

۳. İmam Sadiq (ə) buyurdu: "hər kim mömin qardaşının üzündən qəm-qüssə tozunu silərsə, Allah ona on savab yazar və qardaşının üzünə təbəssüm edən üçün bir savab vardı."(۴)

۸۵. QONşUNUN Və BAşQALARıNıN əZIYYəTINə SəBR eTMəYIN MüSTəhəBLIYINə AID BöLMə

۱. Əmr ibn İkrimə deyir ki, imam Sadiqin (ə)

səh:۱۲۱

---

۱- [۱] . Nəhcül-bəlağə, ikinci hissə, səh.۲۰۵.

۲- [۲] . Məsadiqətul-ixvan, səh.۲۴.

۳- [۳] . Həmin mənbə.

۴- [۴] . Həmin mənbə.

".xidmətinə gedib ərz etdim: "Qonşum məni incidir

".İmam (ə) buyurdu: "Onunla mehriban ol

".Mən dedim: "Allah ona rəhm etməsin

O həzrət (ə) üzünü məndən çevirdi. Mən bu vəziyyətlə imamdan (ə) ayrılmaq istəmədim. Buna görə də o həzrətə (ə) izah etdim ki, o mənə müxtəlif cür əziyyətlər verir. İmam (ə) buyurdu: "Güman edirsən ki, əgər onunla aşkarda düşmənçilik etsən "?ondan intiqam alarsan

".Mən dedim: "Onu itaət etməyə məcbur edəcəm

Həzrət (ə) buyurdu: "Sənin bu qonşun elə bir adamdır ki, Allahın nemət verdiyi kəslərə qarşı paxıllıq edir. Əgər bir adamda neməti görərsə, əhli-əyalı olsa onlara əziyyət verər və əgər əhli-əyalı olmazsa, ona yaxşılıq edənə etiraz edər, əgər yaxşılıq edən də (olmasa gecələri oyaq qalar və gündüzləri isə narahatlıq içində keçirər."(١

Allahın saleh bəndəsi (imam Musa Kazım (ə)) buyurdu: "Qonşunu təkcə incitməmək .٢ (ona yaxşılıq etmək demək deyil, bəlkə əziyyətinə dözməkdir."(٢

İmam Baqir (ə) buyurdu: "Mömin üç şeydən birindən xilas olmaz və bəzən də bu .٣ şeylərin üçü də onda olur, ya evin bəzi adamları qapını üzünə bağlamaqla ona əziyyət verərlər, ya qonşusu ona əziyyət verər və yaxud öz ehtiyaclarını əldə etmək üçün



---

.(Üsuli Kafi, səh.٦٢٣ (həqqul-civar . [١] -١

.(Üsuli Kafi, səh.٦٢٤ (həqqul-civar . [٢] -٢

kimsə ona əziyyət verər. Əgər mömin dağın qülləsində olsa da belə, Allah-taala ona əziyyət etmək üçün bir şeytanı göndərər və eyni halda onu imanı ilə ünsiyyətdə saxlayar ki, heç kimdən vəhşətdə olmasın."(۱)

۴. İmam Cəfər Sadiq (ə) buyurdu: "Dünyada qonşusu əziyyət verməyən mömin olmayıb, yoxdur və olmayacaq. Əgər mömin dənizdəki adalarda olsa da belə, Allah ona əziyyət vermək üçün bir kəsi göndərər."(۲)

۵. İmam Sadiq (ə) buyurdu: "Keçmişdə, gələcəkdə və yaşadığınız zamanda qonşusu əziyyət verməyən bir mömin olmayıb və olmayacaq."(۳)

۶. Muaviyə ibn Əmmar deyir ki, imam Sadiq (ə) buyurdu: "Qonşusu əziyyət verməyən mömin yoxdur və qiyamət gününə kimi də olmayacaq."(۴)

۷. İmam Məhəmməd Baqir (ə) buyurur ki, bir nəfər kişi peyğəmbərin (s) yanına gəlib qonşusunun ona əziyyət verməsindən şikayət etdi. Rəsulullah (s) ona buyurdu: "Səbr et."

O yenə də gəldi və qonşusundan şikayət etdi. Peyğəmbər (s) yenə də buyurdu: "Səbr et..."(۵)

۸. İmam Sadiq (ə) buyurdu: "Qonşu ilə yaxşı rəftar etmək ruzini çoxaldar."(۶)



---

۱- [۱]. Üsuli Kafi, səh.۴۳۳.

۲- [۲]. Həmin mənbə.

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Həmin mənbə.

۵- [۵]. Üsuli Kafi, səh.۶۲۴.

۶- [۶]. Əz-zuhd. Kafi kitabından nəql olunub.

۹. İmam Cəfər Sadiq (ə) buyurdu: "Əgər mömin dağın qülləsində sakin olsa da, Allah ona əziyyət vermək üçün bir nəfər göndərər ki, bu yolla ona Allah tərəfindən mükafat verilsin."(۱)

۱۰. Əli ibn Hüseyn (ə) atası imam Hüseyndən (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Mən və məndən qabaqkı peyğəmbərlər bizə əziyyət verənlərin əlində giriftar olmuşuq. Əgər mömin dağın başında olsa da belə, Allah-taala ona əziyyət vermək üçün bir nəfər göndərər və bu vasitə ilə (yəni səbr etməsinə görə) Allah ona savab verər."

Əmirəlmöminin (ə) buyurdu: "Anam məni dünyaya gətirən zamandan bəri həmişə məzlum olmuşam. Һətta (qardaşım) Əqil gözləri ağrıyandan sonra deyərdi: Məni yox, əgər Əlini (ə) çiyninizə götürsəniz götürün. Bir halda ki mənim gözlərim ağrımırdı."(۲)

۱۱. Һəzrət Riza (ə) atalarından nəql edir ki, Rəsulullah (s) buyurdu: "Qonşusu əziyyət verən heç bir mömin olmayıb və qiyamət gününə kimi olmayacaq."(۳)

۱۲. İmam Əliyyənnəqi (ə) atalarından nəql edir ki, imam Sadiq (ə) buyurdu: "Qonşusu əziyyət verməyən heç bir mömin olmayıb və qiyamət gününə kimi olmayacaq."

səh:۱۲۴

---

۱- [۱]. İləluş-şəraye, səh.۲۶.

۲- [۲]. Həmin mənbə.

۳- [۳]. Uyunu əxbarir-Riza, səh.۲۰۱.

İmam Sadiq (ə) buyurubdur: "hər kimin dünyası rahat və giriftarçılıqsız olsa, onun ".dinində şəkk edin

İmam Əliyyənnəqi (ə) deyir ki, imam Sadiq (ə) buyurdu: "Əgər sənin dostundan birinə imarət və vəzifə çatsa, vəzifəyə çatmamışdan qabaqkı vəziyyətinin onda biri qədər ".sənə baxsa, sənin dostun pis dost deyil

İmam Baqir (ə) buyurdu: "Mömindən fərasətinə və şüurlu olmasına görə çəkinin. Çünki (o (həqiqətlər barəsində) İlahi nurun sayəsində düşünür." (١

həzrət (ə) daha sonra bu ayəni oxudu: "Şübhəsiz, bunda ağıl və şüur sahibləri üçün (nişanələr vardır."(٢

İmam Sadiq (ə) Əmirəlmöminindən (ə) nəql edib buyurmuşdur: "Üç əməl yaxşı . ١٣ (işlərdəndir; səxavətli olmaq, yaxşı danışmaq, əzab-əziyyətə səbr etmək."(٣

QONŞUNU INCITMəKDəN çəKINMəYIN VACIBLIYINə AID BöLMə .٨۶

İmam Sadiq (ə) (bir hədisdə) buyurubdur: "Ənsardan bir nəfər Rəsulullahın (s) . ١ yanına gəldi və ərz etdi: Mən bir nəfərdən ev almışam və mənim yaxın qonşum elə bir adamdır ki, ondan xeyir görməyə heç bir ümidim yoxdur və şərrindən də amanda ,(deyiləm. Rəsulullah (s) imam Əliyə (ə



---

.Məcalis, Şeyx Tusinin oğlu, səh.١٧۶ . [١] -١

.hicr surəsi, ayə ٧۵ . [٢] -٢

.Məhasin Bərqi, səh.۶ . [٣] -٣

Salmana, Əbuzərə və daha bir nəfərə güman edirəm ki, Miqdad olsun, əmr etdi məsciddə uca səslə elan etsinlər: Qonşusu zülmündən amanda qalmayan kimsənin .imanı yoxdur

Onlar məscidə gedib üç dəfə uca səslə dedilər. Daha sonra peyğəmbər (s) üzbəüzdə (olan, arxada, sağda və solda olan qırx mənzilə işarə etdi."(١

İmam Sadiq (ə) atası imam Baqirdən (ə) nəql edib buyurur ki, imam Əlinin (ə) . ٢ kitabında oxudum ki, Rəsulullah (s) mühacirlərin, ənsarın və Yəsribdən (Mədinə) olan camaatın arasında yazdı: "Qonşu insanın özü kimidir və gərək ona zərər dəyməsin və ona qarşı günah edilməsin. Qonşunun qonşuya olan ehtiramı insanın anasına olan (ehtiramı kimidir."(٢

İmam Sadiq (ə) buyurur ki, həzrət Fatimə (ə) bəzi işlər barəsində şikayət etmək üçün .٣ peyğəmbərin (s) yanına gəldi. Peyğəmbər (s) ona bir lövhə verdi və buyurdu: "Bu ".lövhədə yazılanları yadda saxla

Orada belə yazılıbdır: "hər kimin Allaha, qiyamət gününə imanı vardırsa, qonşusuna əziyyət verməsin, hər kimin Allaha və qiyamət gününə imanı vardırsa, qonağına ehtiram etsin. hər kimin Allaha və qiyamət gününə imanı vardırsa, ya gərək xeyirli söz (danışsın, ya da sükut etsin."(٣

:Əbu həmzə deyir ki, imam Sadiq (ə) buyurdu .۴



---

.(Üsuli Kafi, səh.۶٢٣ (babu həqqil-civar . [١] -١

.Həmin mənbə . [٢] -٢

.Həmin mənbə . [٣] -٣

".Mömin o kəsdir ki, qonşusu onun "bəvaiq"indən amanda qalsın"

"?Soruşdum: "Bəvaiq nədir

(Həzrət (ə) buyurdu: "Onun zülm və əzabı."(۱

İmam Sadiq (ə) atalarından, onlar da həzrət Əlidən (ə) nəql edir ki, peyğəmbər (s) .۵ buyurdu: "Hər kim qonşusunu incitsə, Allah cənnətin qoxusunu ona haram edər və yeri cəhənnəmdir, ora necə də pis yerdir. Hər kəs qonşusunun haqqını tapdalasa, o bizdən deyil. Cəbrayıl (ə) həmişə mənə qonşu barəsində tövsiyə edərdi. Belə ki, mən güman etdim qonşum məndən irs aparacaq. O həmişə mənə qullar barəsində nəsihət edərdi. Mən belə güman etdim ki, onlar üçün bir zaman təyin olunubdur və əgər o vaxt gəlib çatsa, onlar azad olunmalıdırlar. Həmçinin dişlərimi fırçalamağı mənə nəsihət edərdi. Mən belə güman edərdim ki, bu mənə vacibdir və mənə gecə oyaq qalmağı o qədər (nəsihət etdi ki, güman etdim ümmətimin yaxşı adamları heç vaxt yatmazlar."(۲

İmam Riza (ə) buyurdu: "Mömin şəxsin xüsusiyyətləri budur ki, yaxşılıq edəndə .۶ sevinər, pis əməl baş verəndə isə məğfirət istəyər, (həqiqi) müsəlman odur ki, sair müsəlmanlar onun dilindən və əlindən amanda olsunlar, əgər onun qonşusu əlindən (amanda deyilsə, o bizdən deyil."(۳



---

.Həmin mənbə .[۱]-۱

.Mən la yəhzuruhul-fəqih, ۲-ci cild, səh.۱۹۷; İqabul-əmal, səh.۴۶" .[۲]-۲

.Uyunu əxbarir-Riza, ۲-ci cild, səh.۲۴ .[۳]-۳

٧. İmam Cəfər Sadiq (ə) buyurdu: "hər kim qonşusunu incitməsə və ona əziyyət verməsə, qiyamət günü Allah onun büdrəməsini bağışlayar, qarnını və övrətini təmiz və pak saxlayan kəs üçün cənnətə zinət verərlər və hər kim mömin bir bəndəni azad edərsə, Allah cənnətdə onun üçün bir ev tikər."(١)

٨٧. QONŞU ILə YAXşı RəFTAR eTMəYIN MüSTəhəBLIYINə AID BöLMə

١. İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Qonşu ilə yaxşı rəftar etmək evləri abad edər və ölümü təxirə salar."(٢)

٢. İmam Cəfər Sadiq (ə) buyurdu: "Qonşu ilə yaxşı rəftar etmək ruzini artırır."(٣)

٣. Əbu Məsud deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Qonşu ilə mehriban olmaq ömürün çoxalmasına və ölkənin abadlığına səbəb olur."(٤)

٤. İmam Sadiq (ə) buyurdu: "Qonşu ilə mehribanlıq etmək evləri abad edər və ömürləri çoxaldar."(٥)

٥. Əbu Rəbi Şami deyir ki, imam Sadiqin (ə) evi cəmiyyətlə dolu idi. həzrət (ə) buyurdu: "Agah olun! Qonşusuyla mehriban olmayan kəs bizdən deyil."(٦)



---

١- [١]. Məcalis, Səduq səh.٣٢٩ (٨٢-ci məclis).

٢- [٢]. Üsuli Kafi, səh.٦٢٤ (babu həqqil-civar).

٣- [٣]. Həmin mənbə.

٤- [٤]. Həmin mənbə.

٥- [٥]. Həmin mənbə.

٦- [٦]. Həmin mənbə.

## QONşULARA YeMəK VeRMəYIN MüSTəhəBLIYI Və ZəRURəT hALıNDA ONUN VACIB OLMASıNA AID BöLMə .۸۸

۱. İmam Baqir (ə) nəql edir ki, Rəsulullah (s) buyurubdur: "Gecəni özü tox və qonşusu ac yatan adam mənə iman gətirməyibdir."

O həzrət (s) həmçinin buyurubdur: "Əgər bir məntəqədə bir nəfər gecəni ac yatsa, Allah qiyamət günü o məntəqənin adamlarına nəzər salmayacaq."(۱)

۲. (İmam Sadiqin (ə) səhabələrindən biri olan) Kahili deyir ki, o həzrət (ə) buyurdu: "Yəqubun oğlu Benyamin onun yanından gedəndə Yəqub (ə) nida etdi: İlahi mənə rəhm etmirsən?! Mənim gözlərimi aldın, iki övladımı (Yusif (ə) və Benyamini) da apardın.

Allah-taala Yəquba (ə) vəhy etdi: Əgər o iki nəfərin ruhunu alsaydım, sənə tərəf qayıtmaq üçün diriləldərdim. Amma yadına sal ki, sən qoyunu kəsdin, bişirdin və yedin, sənin qonşun isə oruc tutmuşdu və o qoyunun ətindən ona heç vermədin."(۲)

۳. Başqa bir rəvayətdə isə buyurub: "Bu əhvalatdan sonra hər gün sübh çağı həzrət Yəqub (ə) tərəfindən bir nəfər onun evindən bir fərsəng məsafəyə qədər nida edərdi: hər kim nahar, ya da günorta yeməyi istəyirsə, Yəqubun (ə) evinə gəlsin.



---

۱- [۱] . Həmin mənbə.

۲- [۲] . Həmin mənbə.

Elə ki, axşam olardı elan edərdi ki, hər kim şam yeməyi istəyirsə, Yəqubun (ə) yanına gəlsin."(۱)

ƏMəLI PIS ADAMLA QONŞU OLMAğıN MəKRUh OLMASıNA AID BöLMə .۸۹

۱. İmam Məhəmməd Baqir (ə) buyurdu: "İnsanın belini sındıran bəlalardan da biri əməli pis olan qonşudur. O əgər yaxşılığı görərsə gizlədər, pisliyi isə müşahidə etsə onu yayar."(۲)

۲. İmam Cəfər Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Pis qonşudan Allaha pənah aparıram. O elə bir evdə yaşayır ki, səni gözləri ilə nəzarət altında saxlayır və qəlbi ilə də sənə diqqət yetirir. Əgər səni rahatlıq içində görsə, narahat olar və əgər pis vəziyyətdə görsə, sevinər."(۳)

۳. İmam Cəfər Sadiq (ə) öz atalarından nəql edir ki, peyğəmbər (s) imam Əliyə (ə) etdiyi vəsiyyətində buyurdu: "Ya Əli! Dörd şey insanın belin sındırar: ۱. Camaatın əmrinə itaət etdiyi rəhbər, amma o özü isə Allaha itaət etməyir. ۲. Əri paklığı və iffəti üçün çalışdığı qadın, ancaq o ərinə xəyanət edir. ۳. Yoxsulluq ki, insanın köməyi tapılmır. ۴. Bir evdə sakin olan pis qonşu."(۴)



---

۱- [۱] . Həmin mənbə.

۲- [۲] . babu həqqil-civar) Üsuli Kafi, səh.۶۲۵).

۳- [۳] . Həmin mənbə.

۴- [۴] . "Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۳۳۸.

۹۰. həR TəRəFDəN QıRX eVə KIMI QONşULUQ həDDINə RIAYəT eDILMəSININ MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Baqir (ə) buyurdu: "Qonşuluğun həddi qırx evə kimidir. Qabaqdan, arxadan, sağ tərəfdən və sol tərəfdən."(۱)

۲. İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Qabaqdan, arxadan, sağ tərəfdən və sol tərəfdən hər qırx ev qonşu sayılır."(۲)

۳. Muaviyə ibn Əmmar deyir ki, imam Sadiqə (ə) ərz etdim: "Sənə fəda olum, qonşuluğun həddi nə qədərdir?!"

həzrət (ə) buyurdu: "hər tərəfdən qırx ev."(۳)

۴. İmam Sadiq (ə) atalarından nəql edir ki, Əmirəlmöminin (ə) buyurdu: "Məscidin ətrafı qırx zira (təqribən qırx metr) və qonşuluğun ətrafı isə dörd tərəfdən qırx evdir."(۴)

۹۱. SəFəR YOLDAşı ILə MüLAYIM RəFTAR eTMəYIN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Cəfər Sadiq (ə) Rəsulullahdan (s) nəql edib buyurubdur: "Səfərə çıxanın yoldaşlarının boynunda olan haqqlarından biri də budur ki, əgər o xəstələnərsə, ona görə üç gün dayansınlar."(۵)



---

۱- [۱]. babu həqqil-civar) Üsuli Kafi, səh.۶۲۵).

۲- [۲]. Həmin mənbə.

۳- [۳]. Məaniyul-əxbar, səh.۵۲.

۴- [۴]. Vəsail, ۲-ci cild, səh.۴۸۴ (əhkamul-məsacid); Xisal, Səduq ۲-ci cild, səh.۱۱۴.

۵- [۵]. babu husnus-səhabə) Üsuli Kafi, səh.۶۲۵).

۲. İmam Sadiq (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Bir-birləri ilə dostluq edən iki nəfərdən hansı dostuna qarşı daha çox mülayim və mehriban olarsa, onun savabı daha çox olar və o Allah yanında daha da əzizdir."(۱)

۳. İmam Cəfər Sadiq (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Əgər səfərdə sizin yoldaşlarınızdan biri xəstələnsə, üç gün ona xatir dayanın."(۲)

۴. İmam Sadiq (ə) buyurdu: "Kar olan adamın qulağına söz demək yorğunluğa səbəb deyilsə, bu bəyənilmiş sədəqədir."(۳)

۹۲. SəFəR YOLDAşıNDAN AYRıLANDA ZIMMI (KAFIR) Də OLSA, ONU öTüRMəYIN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Sadiq (ə) öz atalarından nəql edir ki, Əmirəlmöminin (ə) bir zimmi kişi ilə yol yoldaşı oldu. Zimmi şəxs o həzrətə (ə) dedi: "Məqsədin haradır?"

həzrət (ə) buyurdu: "Kufəyə getmək istəyirəm."

Zimmi şəxs ayrılıb öz yolu ilə gedəndə Əmirəlmöminin (ə) da onunla birlikdə getdi. O kişi soruşdu: "Niyə yolunu mən getdiyim istiqamətə dəyişdin?"

həzrət (ə) buyurdu: "Bu yaxşı yoldaşlığın əlamətidir. Gərək insan ayrılanda öz yol yoldaşını



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. Qurbul-əsnad, səh.۶۴.

۳- [۳]. Səvabul-əmal, səh.۱۳۹ (babu səvabus-sədəqəti).

".bir neçə addım ötürsün və bu bizim peyğəmbərimizin (s) əmridir

(Bu əhvalatın ardında deyilir ki, o zimmi kişi bu cəhətə görə müsəlman oldu.(١

## ٩٣. SəFəRDə OLANDA MəKTUB YAZMAğıN MüSTəhəBLIYI Və ONA CAVAB VeRMəYIN VACIBLIYINə AID BöLMə

١. İmam Sadiq (ə) buyurdu: "Məktuba cavab yazmaq salama cavab vermək kimi (vacibdir."(٢

٢. İmam Cəfər Sadiq (ə) buyurdu: "Dostlar arasında olan əlaqə, hüzurları olanda (yəni səfərdə olmayanda) bir-birlərinin görüşlərinə getmək və səfərdə olanda da bir-birinə (məktub yazmaqladır."(٣

٣. Əl-İxvan" kitabında imam Sadiqdən (ə) nəql olunubdur: "Dostlar arasında olan" əlaqə, bir-birinin görüşünə getmək və səfərdə olan da isə məktub yazmaqdan (ibarətdir."(٤

## ٩۴. MəKTUBU "BISMILLAh"LA BAşLAMAQ Və ONU DAhA YAXşı XəTLə YAZMAğıN MüSTəhəBLIYINə AID BöLMə

١. İmam Sadiq (ə) buyurdu: "(Məktubu) yazanda "Bismillahir-rəhmanir-rəhim"i (unutma, hərçənd ki, şer olsa da belə."(۵



---

١- [١] . babu husnus-səhabə) Üsuli Kafi, səh.۶٢۵).
٢- [٢] . babut-təkatub) Üsuli Kafi, səh.۶٢۵).
٣- [٣] . Həmin mənbə.
۴- [۴] . Əl-İxvan, səh.٢٨.
۵- [۵] . babun-nəvadir fi axiril-kitab) Üsuli Kafi, səh.۶٢۶).

۲. İmam Cəfər Sadiq (ə) buyurdu: "(Məktubun əvvəlində) "Bismillahir-rəhmanir-rəhim" sözünü daha yaxşı xəttlə yaz və əgər "sin" hərfini dişli şəkildə yazsan "be" hərfini uzadılmış halda yazma."(۱)

۳. Əli ibn Musa ər-Riza (ə) bir hədisdə atalarından nəql edir ki, Əmirəlmömininindən (ə) soruşdular: "Tubbə niyə "tubbə" adlanıb?"

İmam (ə) buyurdu: "Özündən qabaqkı padşah üçün məktub yazan bir cavan oğlan idi. O məktubların əvvəlində "şimşək və küləyi yaradan Allahın adıyla" sözünü yazardı. Padşah ona dedi: Məktubun başlanğıcında "şimşək mələyinin adıyla" sözünü yaz.

Cavan dedi: Mən məktubu öz Allahımın adından savayı bir şeylə başlamayacam və bundan sonra sənin fərmanlarını yazacam.

Allah bu əmələ görə ona təşəkkür etdi və o ölkənin hakimiyyətini ona verdi. Camaat da ona itaət etdilər. Bu səbəb görə də o Tubbə adlandı."(۲)

۹۵. MəKTUBUN üNVANıNı YAZMAğıN QAYDASı

۱. İmam Sadiq (ə) buyurdu: "(Məktublaşmalarda) "Bismillahir-rəhmanir-rəhim"dən sonra fəsiləsiz "filankəs üçün" sözünü yazma. Lakin məktubun arxasına "filankəs üçün" sözünü yazmağın eybi yoxdur."(۳)



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. İləluş-şəraye, səh.۱۷۶; Uyunu-əxbarir-Riza, səh.۱۳۳.

۳- [۳]. Üsuli Kafi, səh.۶۲۷ (babun-nəvadir fi axiril-kitab).

۲. İmam Cəfər Sadiq (ə) buyurdu: "Məktubun içində "filankəs üçün" sözünü yazma, əksinə "filankəsə tərəf" sözünü yaz və məktubun arxasına isə "filankəs üçün" yaz."(۱)

۹۶. MəKTUB GöNDəRILəN ADAMıN ADıNı MəKTUBUN BAşLAğıCıNDA YAZMAğıN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "İnsanın məktubun əvvəlində öz adından qabaq dostunun adını yazmağının eybi yoxdur."(۲)

۲. Səmaə deyir ki, imam Sadiqdən (ə) bir nəfərin adını məktubun başlağıcında yazan adamın haqqında soruşdum. həzrət (ə) buyurdu: "Eybi yoxdur. Bu bir fəzilətdir və insan öz dostuna onun vasitəsilə ehtiram göstərir."(۳)

۹۷. MəKTUBDA MüNASIB YeRDə "INşAALLAh" SöZüNü YAZMAğıN MüSTəhəBLIYINə AID BöLMə

۱. Murazim ibn həkim deyir ki, imam Sadiq (ə) bir işə görə məktub yazmağa əmr etdi. Məktubu yazıb o həzrətin (ə) nəzərinə çatdırdılar və orada "inşaallah" kələməsi yox idi. İmam (ə) buyurdu: "Burada "inşaallah" kələməsi yoxdur və siz necə ümid edə bilərsiniz ki, bu bir nəticə versin? Burada siz diqqət edin və harada lazımdırsa yazın."(۴)



---

۱- [۱] . Həmin mənbə.

۲- [۲] . Həmin mənbə.

۳- [۳] . Həmin mənbə.

۴- [۴] . Həmin mənbə.

۹۸. MəKTUBUN XəTTLəRINI QURUTMAğıN MüSTəhəBLIYINə AID BöLMə

۱. Əhməd ibn Məhəmməd Əbi Nəsr deyir ki, Əbul-Həsən Əli ibn Musa ər-Riza (ə) (qurulamaq üçün) məktubun üzərinə torpaq tökərdi və buyurardı: "Eybi yoxdur."(۱)

۲. (İmam Musa Kazımın (ə) əshabından olan) Əli ibn Ətiyyə deyir ki, imam Kazımın (ə) üzərinə torpaq tökdüyü məktublarını görmüşdü.(۲)

۳. Əhməd ibn Məhəmməd ibn Əbi Nəsr deyir: "İmam Riza (ə) məktubun üzərinə torpaq səpərdi."(۳)

۴. İmam Riza (ə) atalarından nəql edir ki, Rəsulullah (s) buyurdu: "Öz ehtiyaclarınız üçün səhər tezdən evdən çölə çıxın və məktubun (quruması və xəttlərinin itməməsi üçün) üzərinə torpaq səpin ki, bu istəyinizin yerinə yetirilməsi üçün təsirlidir və xeyiri də gülərüz insanların yanında axtarın."(۴)

۹۹. ALLAhıN ADı, YAXUD QURAN AYəLəRI YAZıLMış KAğıZLARı YANDıRMAğıN CAIZ OLMAMASıNA AID BöLMə

۱. Əbdül-Məlik ibn Ütbə deyir ki, birinci Əbul-Həsən imam Musa Kazımdan (ə) bir yerə

səh:۱۳۶

---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. Həmin mənbə.

۳- [۳]. Qurbul-əsnad, səh.۱۷۰.

۴- [۴]. Xisal, Səduq ۲-ci cild, səh.۳۱.

toplanmış və Allahın adları olan kağızların barəsində soruşdum: "Onları yandırmaq "?olar

(İmam (ə) buyurdu: "Yox, onları əvvəlcə su ilə yuyun, sonra isə yandırın."(١

Abdulla ibn Sənan deyir ki, imam Sadiq (ə) buyurdu: "Kağızları yandırmayın. Əksinə, .٢ (onların xətlərini pozun sonra isə paralayın."(٢

Zürarə deyir ki, imam Sadiqdən (ə) Allahın adlarından birinin ağız suyu vasitəsi ilə .٣ pozulması barəsində soruşdular. İmam (ə) buyurdu: "Əliniz çatdığı pak şeylərdən biri (ilə pozun."(٣

Məhəmməd ibn İshaq ibn Əmmar deyir ki, Əbül-Həsən Musa ibn Cəfərdən (ə) Allah .۴ Əzzəvəcəlin adı yazılmış məktublar barəsində sual soruşuldu. İmam (ə) buyurdu: ("Onları yuyun."(۴

İmam Sadiq (ə) Rəsulullahdan (s) nəql edib buyurmuşdur: "Quran ayələrini və Allahın .۵ adını əliniz çatdığı pak şeylərlə pozun. Peyğəmbər (s) müsəlmanları onları yandırmaqdan, ayaq altında tapdalamaqla aradan aparmaqdan, ya da qələmlə (üstündən xətt çəkməkdən nəhy etmişdir."(۵

Cəfər ibn Məhəmməd (ə) öz babalarından nəql edir ki, peyğəmbər (s) (müsəlmanları) .۶ Quran



---

.(Üsuli Kafi, səh.۶٢٧ (babun-nəvadir . [١] -١

.Həmin mənbə . [٢] -٢

.Həmin mənbə . [٣] -٣

.Həmin mənbə . [۴] -۴

.Həmin mənbə . [۵] -۵

(ayələrini məhv etməkdən, yaxud ağız suyu ilə yazmaqdan nəhy etmişdir.(١)

٧. Həsən ibn Əli Vəşşa deyir ki, Abbas ibn Cəfər ibn Əşəs imam Rizadan (ə) məktublarını oxuyandan sonra onların başqalarının əlinə düşməməsi üçün yandırması barəsində soruşmağımı məndən istədi. Vəşşa deyir ki, mən bunu soruşmamışdan qabaq həzrət (ə) mənə məktub yazdı və buyurdu: "Öz dostuna de: Mən məktubları oxuyandan sonra onları yandırıram." (Şeyx Hürr Amili buyurur: Bu məsələnin caiz olmasını ya da zərurətini bildirir, yaxud da Allahın adı və Quran ayələri olmayan (məktublara aid olur.)(٢)

٨. Əli ibn Cəfər deyir ki, qardaşım imam Musa Kazımdan (ə) yazılı kağızları yandırmaq barəsində soruşdum. İmam (ə) buyurdu: "Əgər qorxsan ki, onda bir şey vardır (və (düşmənin əlinə düşər) yandırmağın eybi yoxdur."(٣)

١٠٠. VAXTıNı DOSTLAR ARASıNDA BəRABəR şəKILDə BöLMəYIN MüSTəhəBLIYINə AID BöLMə

١. İmam Sadiq (ə) buyurdu: "Rəsulullah (s) vaxtını dostları arasında bölərdi və hamıya ".bir gözlə baxardı

həmçinin buyurdu: "Peyğəmbər (s) heç vaxt



---

١- [١] . "Mən la yəhzuruhul-fəqih", ٢-ci cild, səh.١٩۶.
٢- [٢] . Uyunu əxbarir-Riza, səh.٣٣٧; Kəşful-ğəmmə, səh.٢۶٩.
٣- [٣] . Qurbul-əsnad, səh.١٢٢.

ayaqlarını dostlarının qabağında uzatmazdı, onlarla əl görüşəndə onlar əllərini çəkməmişdən qabaq əlini çəkməzdi. həzrətin (s) səhabələri bunu başa düşəndən sonra o həzrətlə (s) görüşəndə birinci onlar əllərini çəkərdilər."(۱)

۲. İmam Cəfər Sadiq (ə) buyurdu: "Allah peyğəmbəri (s) məbus edəndən bəri həzrət (s) söykənən halda yemək yemədi, heç vaxt onunla olan şəxsin yanında ayağını digər ayağının üstünə aşırmadı, heç vaxt görüşəndə qarşı tərəf əlini çəkməmişdən qabaq öz əlini çəkməzdi və heç vaxt saili (yolçunu) əliboş geri qaytarmadı. Əgər bir şey olsaydı, ona verərdi və olmasaydı buyurardı: Allah yetirər."(۲)

۳. İmam Baqir (ə) buyurdu: "İnsan dostu ilə görüşəndə, əl görüşməkdə davam edən şəxsin savabı daha da çox olur və onun günahlarının hamısı görüşü qurtarana kimi bağışlanar."(۳)

۴. İmam Sadiq (ə) buyurdu: "Rəsulullah (s) kiminləsə görüşsəydi, o şəxs əlini çəkməyənə qədər həzrət (s) əlini onun əlindən çəkməzdi."(۴)

۱۰۱. DOSTUN ADı, FAMILYASı, əSIL-NəSəBI, əhVALı Və DOSTLARı BARəSINDə SUAL SORUşMAğıN MüSTəhəBLIYINə AID BöLMə

۱. Əli ibn Hüseyn (ə) nəql edir ki, bir gün Rəsulullah



---

۱- [۱]. Üsuli Kafi, səh.۶۲۶ (babun-nəvadir); Rövzeyi Kafi, səh.۲۶۸.

۲- [۲]. Rövzeyi Kafi, səh.۱۶۴.

۳- [۳]. Üsuli Kafi, səh.۴۰۰ (babul-musafihə).

۴- [۴]. Həmin mənbə.

"?s) dostlarına buyurdu: "Bilirsiniz acizlik nədir)

".Onlar dedilər: "Allah və Onun Rəsulu (s) daha yaxşı bilir

həzrət (s) buyurdu: "Üç şey acizliyin əlamətidir: Birincisi budur ki, insan yemək hazırlayıb dostunu dəvət edər, amma onun dostu verdiyi vədəyə əməl etməyib gəlməsin. İkincisi də budur ki, bir nəfər digər bir şəxslə dostlaşır və maraqlanıb bilmək istəyir ki, o kimdir və haradandır? Amma həmin şəxs ondan ayrılanda soruşmur. Üçüncüsü də qadınlar barəsindədir və insan öz qadınına yaxınlaşıb ondan ləzzət alır, ".amma qadını isə öz ərindən faydalana bilmir

"?Əmr Asın oğlu Abdulla ərz etdi: "Nə etmək lazımdır

həzrət (s) buyurdu: "hər ikisi ləzzət almaq üçün bir-birlərini təhrik etsinlər (həyəcana (gətirsinlər)."(١)

Əli ibn Hüseyn (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "İnsanların ən acizi o kəsdir ki, .٢ kimsəylə görüşəndə onun rəftarından xoşu gəlsin, amma onun adını, əsil-nəsəbini və (yaşadığı məhəlləni soruşmasın."(٢)

İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Əgər sizlərdən kimsə . ٣ müsəlman qardaşını çox sevirsə, onun adı, atasının adı, qəbiləsinin və tayfasının adı haqqında soruşsun. Bu dostluqdakı



---

.(Üsuli Kafi, səh.۶٢۶ (babun-nəvadir fi axiril-kitab . [١]-١

.Həmin mənbə . [٢]-٢

vacib hüquqdan və səfa-səmimiyyətdən sayılır, yoxsa onların tanışlığı düzgün olmaz."(۱)

۴. İmam Cəfər Sadiq (ə) atasından nəql edir ki, Rəsulullah (s) buyurdu: "Üç şey zülmdür: ۱. İnsan bir kəslə dostluq edə, lakin onun adını və familyasını soruşmaya. ۲. Əgər onu kimsə yemək yeməyə dəvət edərsə və o bunu qəbul etməsə, ya da onun dəvətini qəbul edib, ancaq yemək yeməsə. ۳. Ailəsi ilə zarafatlaşmamışdan qabaq cinsi əlaqədə olarsa."(۲)

۱۰۲. DOSTLAR ARASıNDA həYA Və ISMəTIN ARADAN GeTMəSININ MəKRUhLUğUNA AID BöLMə

۱. İmam Cəfər Sadiq (ə) buyurdu: "Müsəlman qardaşına kamil şəkildə arxayın olma. Çünki insanın arxayınlıq və səmimi qurulmuş ünsiyyətdən sonra yerə yıxılması heç bir şeylə əvəz olmur."(۳)

۲. Səmaə deyir ki, imam Musa Kazım (ə) buyurdu: "Səninlə və müsəlman qardaşının arasındakı hörmət aradan götürülməsin və bir-birinizin hörmətini saxlayın. Çünki ehtirama riayət etməmək həyanı aradan aparar."(۴)

۳. İmam Cəfər Sadiq (ə) buyurdu: "Dostluğun bir neçə şərti vardır. hər kim o şərtlərə riayət etməsə onu kamil dost saymaq olmaz və hər kimdə



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. Qurbul-əsnad, səh.۷۴.

۳- [۳]. babun-nəvadir fi axiril-kitab) Üsuli Kafi, səh.۶۲۶).

۴- [۴]. Həmin mənbə.

o şərtlərdən heç birisi olmasa onu dost bilmə. (O şərtlər belədir:) ١. Zahiri və batini bir olsun. ٢. Sənin yaxşılığını öz yaxşılığı və sənin pisliyini öz pisliyi bilsin. ٣. Var-dövlət, vəzifə və məqamı onu sənə qarşı dəyişdirməsin. ۴. Gücü və qüdrəti nəyə çatırsa səndən əsirgəməsin. ۵. Giriftarçılıqda səni tərk etməsin."(١)

۴. İmam Sadiq (ə) dostlarından bəzisinə buyurdu: "Öz dostuna kamil şəkildə arxayın olma. Çünki arxayınlıq və çox ünsiyyət qurmaq nəticəsində yerə yıxılmaq əvəzolunmaz zərbədir."(٢)

۵. İmam Sadiq (ə) dostlarından bəzisinə buyurdu: "hər kim üç dəfə sənin əlindən qəzəblənsə və sənin haqqında pis danışmasa onu özün üçün dost seç."(٣)

۶. İmam Sadiq (ə) buyurdu: "Dostunu öz sirrindən agah etmə. Bu o həddə olsun ki, əgər sənin düşmənin o sirdən agah olsa, sənə zərər vura bilməsin. Çünki mümkündür ki, dost bir gün düşmən olsun."(۴)

٧. Əli ibn Musa ər-Riza (ə) atalarından, onlar da Əmirəlmömininindən (ə) nəql edib buyurmuşdur: "Dostluqda öz dostunla həddini aşma. Çünki bəlkə bir gün o sənin düşmənin olsun və düşmənçilikdə də düşməninlə orta həddi gözlə. Çünki



---

١-[١]. Məcalis, Səduq səh.٣٩٧ (٩۵-ci məclis).

٢-[٢]. Həmin mənbə.

٣-[٣]. Həmin mənbə.

۴-[۴]. Həmin mənbə.

mümkündür bir gün o sənin dostun olsun."(1)

8. Təbərsi "Məcməul-bəyan" təfsirində Allah-taalanın buyurduğu "Ümumi məclislərinizdə çirkin işlər görürsünüz?!"(2) ayəsi barəsində buyurmuşdur: "Burada bir neçə nəzər vardır. Biri budur ki, ərəblər bir yerə toplananda bir-birlərindən utanmadan bədənlərindən mədə havası (yel) çıxarardılar."(3)

103. DOSTLARıNA YAXşıLıQ eDəNI Və NAMAZLARıNı VAXTıNDA QıLANLARı DOST SeçMəYə AID BöLMə

1. İmam Sadiq (ə) buyurdu: "Dostlarınızı iki şeylə imtahan edin və yoxlayın. Əgər bu iki şey olmasa onlardan uzaqlaşın, uzaq gəzin və yenə də uzaq gəzin. O iki şey ibarətdir: Vaxtında namaz qılmaq, çətinlikdə və yaxşı gündə dostlara kömək etmək."(4)

104. CAMAATLA YAXşı əXLAQLA RəFTAR eTMəYIN MüSTəhəBLIYINə AID BöLMə

1. İmam Məhəmməd Baqir (ə) buyurdu: "Camaatın daha imanlısı onların daha yaxşı əxlaqlısıdır."(5)

2. İmam Sadiq (ə) buyurdu: "hər kimdə dörd şey olsa imanı kamildir və əgər başdan ayağa günahkar da olsa belə ona heç bir zərəri olmaz. Onlar



---

1- [1]. Məcalis, Şeyx Tusinin oğlu, səh.232.

2- [2]. Ənkəbut surəsi, ayə 29.

3- [3]. Məcməul-bəyan təfsiri, 8-ci cild, səh.280.

4- [4]. Üsuli Kafi, səh.626 (babun-nəvadir fi axiril-kitab).

5- [5]. Üsuli Kafi, səh.357 və 358 (babu husnul-xulq).

ibarətdirlər; doğru danışmaqdan, əmanəti qaytarmaqdan, həyadan və yaxşı əxlaqdan."(1)

3. İmam Sadiq (ə) nəql edir ki, Rəsulullah (s) buyurubdur: "Əxlaqı yaxşı olan insan üçün gecə oyaq qalıb oruc tutan adamın əcri qədər mükafatı vardır."(2)

4. İmam Sadiq (ə) buyurdu: "Yaxış əxlaq sahibinə gecə oyaq qalıb oruc tutan adamın savabını çatdırır."(3)

5. İmam Sadiqdən (ə) nəql olunur ki, yaxşılıq və yaxşı əxlaq evlərin abadlığına və ömürün çoxalmasına səbəb olur.(4)

6. İmam Sadiq (ə) buyurdu: "Yaxşı əxlaq günəşin buzu əritdiyi kimi günahları da əridir."(5)

7. İmam Sadiq (ə) buyurdu: "Bacardığın qədər o kəslərlə otur-dur et ki, sənin xeyrin onlara dəysin. Çünki bəzən bəndə ibadətində səhlənkarlıq edir, ancaq əxlaqı yaxşıdır və Allah onun yaxşı əxlaqına görə onu gecə oyaq qalıb oruc tutanın dərəcəsinə çatdırır."(6)

8. İmam Sadiq (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Mənim ümmətimi cənnətə daxil edən ən çox şey İlahi təqva və yaxşı əxlaqdır."(7)

9. İmam Cəfər Sadiq (ə) buyurdu: "İnsanların



---

1- [1]. Həmin mənbə.
2- [2]. Həmin mənbə.
3- [3]. Həmin mənbə.
4- [4]. Həmin mənbə.
5- [5]. Həmin mənbə.
6- [6]. Həmin mənbə.
7- [7]. Həmin mənbə.

daha ağıllısı onların ən yaxşı əxlaqı olanıdır."(۱)

۱۰. Ənbəsə Abid deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Mömin vacib əməlləri yerinə yetirəndən sonra Allah yanında daha sevimli şey onun xalqla olan yaxşı əxlaqıdır."(۲)

۱۱. Bəhr (ibn Kəsir) Səqqa deyir ki, imam Sadiq (ə) mənə buyurdu: "Ey Bəhr Səqqa! Yaxşı əxlaq işlərin asanlaşmasının səbəbidir."

Həzrət (ə) daha sonra bir hədisi buyurdu: "Peyğəmbər (s) gözəl əxlaqlı idi." (۳)

۱۲. İmam Sadiq (ə) buyurdu: "Allah-taala peyğəmbərlərindən bəzisinə vəhy etdi: Yaxşı əxlaq günəş buzu əritdiyi kimi xətaları da (səhvləri də) aradan aparar." (۴)

۱۳. Əli ibn Hüseyn (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Qiyamət günü insanın əməl tərəzisində yaxşı əxlaqdan da daha yaxşı şey olmaz."(۵)

۱۴. İmam Sadiq (ə) buyurdu: "Yaxşı əxlaq və rəftar elə bir bəxşişdir ki, Allah onu yaratdıqlarına əta edir. Onlardan bəzisi fitri və bəzisi də niyyət və iradəsinə bağlıdır. (Yəni insan onu iradət və qəsd etməklə ələ gətirir)."

Ərz etdim: "Bunların hansı daha yaxşıdır?"



---

۱- [۱]. Üsuli Kafi, səh.۱۲.

۲- [۲]. babu husnul-xulq (Üsuli Kafi, səh.۳۵۷, ۳۵۸ və ۳۵۹).

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Həmin mənbə.

۵- [۵]. Həmin mənbə.

həzrət (ə) buyurdu: "Fitri olan insanla birlikdə yaradılıb və insan ondan başqa bir şeyi edə bilməz, insanın niyyət və iradəsinə bağlı olanı insan gərək onun olması üçün səbr etsin və çətinliyə dözsün. Bu daha da yaxşısıdır."(١)

.١٥ İmam Sadiq (ə) buyurdu: "Allah-taala yaxşı əxlaqlı bəndəsinə gecə və gündüz Allah yolunda cihad etmiş kəsin savabını bağışlayır."(٢)

.١۶ İmam Riza (ə) atalarından nəql edir ki, peyğəmbər (s) buyurdu: "Cəbrayıl (ə) aləmlərin Pərvərdigarı tərəfindən mənə nazil oldu və dedi: Ey Məhəmməd! Sənə yaxşı əxlaqı nəsihət edirəm. Çünki bu dünya və axirət xeyrinə səbəbdir. Bilin ki, sizin mənə daha çox oxşayanız sizin daha yaxşı əxlaqlınızdır!"(٣)

.١٧ İmam Riza (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Sizə yaxşı əxlaqı nəsihət edirəm. Çünki yaxşı əxlaqlı insanın yeri şübhəsiz cənnətdir və əxlaqsızlıqdan pərhiz et. Çünki əxlaqsızın yeri şübhəsiz ki, cəhənnəm odudur."(۴)

.١٨ İmam Riza (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Pis əxlaq sirkə balı çürütdüyü kimi insanın əməlini də korlayır."(۵)

.١٩ İmam Riza (ə) peyğəmbərdən (s) nəql edib

səh:١۴۶

---

١- [١] . Həmin mənbə.

٢- [٢] . Həmin mənbə.

٣- [٣] . Uyunu əxbarir-Riza, səh.٢١٣.

۴- [۴] . Uyunu əxbarir-Riza, səh.١٩٩; Səhifətur-Riza, səh.١۴.

۵- [۵] . Uyunu əxbarir-Riza, səh.٢٠٣; Səhifətur-Riza, səh.١٩.

buyurur: "Bəndə yaxşı əxlaq vasitəsilə gecə oyaq qalıb oruc tutan adamın mükafatını alar."(1)

20. İmam Riza (ə) Rəsulullahdan (s) nəql edib buyurur: "Əməllərin ölçülməsində heç bir şey yaxşı əxlaqdan daha ağır ola bilməz."(2)

21. İmam Riza (ə) həzrət Əlidən (ə) nəql edib buyurur: "Sizin iman cəhətindən daha kamil olanınız sizin daha yaxşı əxlaqı olanınızdır."(3)

22. həzrət Riza (ə) nəql edir ki, həzrət Əli (ə) buyurdu: " Yaxşı əxlaq daha yaxşı dostdur."(4)

23. həzrət Riza (ə) Əli ibn Əbi Talibdən (ə) nəql edib buyurur: "Rəsulullahdan (s) soruşdular: Cənnətə daxil olmaq üçün ən yaxşı vasitə nədir?

həzrət (s) buyurdu: Pərhizkarlıq və yaxşı əxlaq."(5)

24. İmam Riza (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "Qiyamət günündə sizin mənə ən yaxın olanınız ailəsinə qarşı daha mehriban və yaxşı əxlaqlınızdır."(6)

25. O həzrət (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "İman cəhətindən camaatın daha yaxşısı onların əxlaqlı olanı və öz ailəsinə qarşı daha çox mehriban olanıdır. Mən də öz ailəmə sizdən də daha mehribanam."(7)



---

1- [1]. Həmin mənbə.

2- [2]. Həmin mənbə.

3- [3]. Həmin mənbə.

4- [4]. Uyunu əxbarir-Riza, səh.204; Səhifətur-Riza, səh.21.

5- [5]. Həmin mənbə.

6- [6]. Həmin mənbə.

7- [7]. Həmin mənbə.

۲۶. İmam Həsən (ə) buyurdu: "Ən yaxşı yaxşılıq yaxşı əxlaqdır."(۱)

۲۷. Peyğəmbər (s) buyurdu: "Yaxşı əxlaq dinin yarısıdır."(۲)

۲۸. Ziyad ibn Əlaqə ibn Şərik deyir ki, Rəsulullahdan (s) soruşdular: "Müsəlmana verilən ən yaxşı şey nədir?"

həzrət (s) buyurdu: "Yaxşı əxlaq."(۳)

۲۹. İmam Cəfər Sadiq (ə) buyurdu: "Allah din olaraq İslamı sizin üçün bəyənibdir, siz də səxavətlik və yaxşı əxlaqla onu zinətləndirin."(۴)

۳۰. Ümmü Sələmə peyğəmbərə (s) ərz etdi: "Atam və anam sənə fəda olsun! Əgər bir qadının iki əri olubsa və onların hər ikisi cənnət əhlidirsə, qadın cənnətdə onlardan hansına aid olacaq?"

Peyğəmbər (s) buyurdu: "O daha yaxşı əxlaqı olanı və ailəsinə daha mehribanını seçər. Ey Ümmü Sələmə! Yaxşı əxlaqlı olmaq dünya və axirət xeyrinə səbəb olur."(۵)

۳۱. Musa ibn İbrahim deyir ki, birinci Əbul-Həsən (imam Musa Kazım) (ə) buyurdu: "Allah bəndəsini ən yaxşı şəkildə, ən yaxşı əxlaqda yaratmışdır və onun ətini qiyamət günündə cəhənnəm oduna yem etməkdən həya edir."(۶)

səh:۱۴۸

---

۱- [۱]. Xisal, Səduq, ۱-ci cild, səh.۱۷.

۲- [۲]. Həmin mənbə.

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Məcalis, Səduq, səh.۱۶۳ (۴۶-cı məclis).

۵- [۵]. Səvabul-əmal, səh.۹۸; Məcalis, Səduq, səh.۲۹۸ (۷۵-ci məclis).

۶- [۶]. Səvabul-əmal, səh.۹۸.

۳۲. Əli ibn Meymun Saiğ deyir ki, imam Sadiq (ə) buyurdu: "hər kim Allahın rəhmətini qazanmaq və Allahın onu cənnətdə sakin etməsini istəsə gərək əxlaqını gözəlləşdirsin, ədalətə riayət etsin, yetimə rəhm etsin, zəifə kömək etsin və Allah bəndələrinin qarşısında təvazökarlıq göstərsin."(۱)

۳۳. Məaniyul-əxbar" kitabında nəql olunubdur ki, Loğman oğluna dedi: "Əziz oğlum!" Yüz nəfər dostun olsun, ancaq bir nəfər düşmənin olmasın. Oğlum! hər nə varsa sənin xeyrin və əxlaqındır. Sənin xeyrin dinin və əxlaqın da ədəbin və camaatla rəftarındır. Xalqı özünlə düşmən etmə, bəyənilmiş əxlaqı öyrən. Oğlum! Yaxşılığa qul ol, pisliyə isə övlad olma. Oğlum! Əmanəti sahibinə qaytar ki, sənin dünya və axirətin yaxşı olsun. Ehtiyacsız olmaq üçün əmin (əmanətçi) ol."(۲)

۳۴. İmam Cəfər Sadiq (ə) nəql edir ki, Rəsulullah (s) buyurdu: "İman cəhətindən möminlərin daha kamili onların daha əxlaqlısıdır."(۳)

۳۵. Peyğəmbər (s) buyurdu: "İman cəhətindən möminlərin daha kamil olanı onların daha yaxşı əxlaqlı olanıdır və sizin ən yaxşınız o kəsdir ki, ailəsi ilə ən yaxşı rəftarı etmiş olsun."(۴)

səh:۱۴۹

---

۱- [۱] . Məcalis, Səduq, səh.۲۳۴ (۹۱-ci məclis).

۲- [۲] . Məaniyul-əxbar, səh.۷۴.

۳- [۳] . Məcalis, Şeyx Tusinin oğlu, səh.۸۷.

۴- [۴] . Məcalis, Şeyx Tusinin oğlu, səh.۲۵۰.

۳۶. İmam Cəfər Sadiq (ə) atalarında nəql edir ki, Rəsulullah (s) buyurdu: "Qiyamət günündə bəndənin əməl tərəzisində ölçmək üçün qoyulan ilk şey yaxşı əxlaqıdır."(۱)

۱۰۵. XALQLA MehRIBAN OLMAQ Və üNSIYYəT QURMAğıN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Sizin ən üstün olanınız yaxşı əxlaqlınız və bağışlayanınız, xalqla ünsiyyət quran və başqaları da onunla ünsiyyət quran, camaatla get-gəl edəninizdir."(۲)

۲. İmam Sadiq (ə) buyurdu: "Mömin ünsiyyəti qəbul edəndir. Başqaları ilə ünsiyyət qurmayan və başqalarının da onunla ünsiyyətdə olmadığı kəsin xeyri yoxdur."(۳)

۳. İmam Əli (ə) buyurdu: "Camaatın qəlbləri tez ram olandır. hər kim onlara məhəbbət göstərərsə, ona tərəf üz gətirərlər."(۴)

۱۰۶. CAMAATLA YAXşı RəFTAR eTMəYIN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Sizə sabah (qiyamət günündə) cəhənnəm odu haram olan kəsdən xəbər verməyim?"

Dedilər: "Ver, ya Rəsulullah!"



---

۱- [۱] . Qurbul-əsnad, səh.۲۲.

۲- [۲] . Üsuli Kafi, səh.۳۵۹ (Babu husnul-xulq).

۳- [۳] . Həmin mənbə.

۴- [۴] . Nəhcül-bəlağə, səh.۱۵۵, ikinci hissə.

(həzrət (s) buyurdu: "O əxlaqı və rəftarı yaxşı olan kəsdir."(۱)

۲ .Əbul-Bəxtəri ravisi bilinməyən bir hədisdə deyir ki, imam Sadiq (ə) buyurdu: "Möminlər yaxşı əxlaqlı və mehribandır. O ram olunmuş dəvə kimidir. Əgər cilovunu yığarlarsa itaət edər və əgər daşın üstündə oturdarlarsa, yatar."(۲)

۳. İmam Sadiq (ə) buyurdu: "Dində agahlıq imanın əlamətlərindəndir. Dində agahlığın əlaməti səbrdir, səbrin əlaməti camaatla yaxşı rəftar etməkdir və onları sevməkdir, camaatı sevməyin əlaməti mehribanlıq, mehribanlığın əlaməti isə asan tutmaq və mülayimlikdir."(۳)

۴. İmam Riza (ə) öz atalarından, onlarda imam Əlidən (ə) nəql edir ki, peyğəmbər (s) buyurmuşdur: "Mömin mülayim, yaxşı rəftar edən, səxavətli və yaxşı əxlaqlıdır. Kafir isə kobud, tünd, pis əxlaqlı və təkəbbürlüdür."(۴)

۱۰۷. MehRIBAN Və YAXşı RəFTARDA OLMAğıN MüSTəhəBLIYINə AID BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "Başqalarına yaxşılıq etmək, mehriban olmaq məhəbbət gətirər və insanı cənnətə aparar. həsəd və üzünü turşutmaq isə insanı Allahdan uzaqlaşdırar və cəhənnəmə salar."(۵)



---

۱- [۱] . Səvabul-əmal, səh.۹۴; Məcalis, səh.۱۹۲.

۲- [۲] . Babul-mumin və əlamatuh) Üsuli Kafi, səh.۴۲۵).

۳- [۳] . Məcalis, Şeyx Tusinin oğlu, səh.۱۱۸.

۴- [۴] . Məcalis, Şeyx Tusinin oğlu, səh.۲۳۳; Səduq, Durrul-fiqhiyyə, ۲-ci cild, səh.۳۴۹.

۵- [۵] . husnul-bəşər) Üsuli Kafi, səh.۳۵۹.)

۲. İmam Baqir (ə) buyurdu: "Bir nəfər peyğəmbərin (s) yanına gəldi və ərz etdi: Ya Rəsuləllah! Mənə nəsihət verin."

həzrətin (s) ona olan nəsihətlərindən biri belədir: "Qardaşını gülərüzlə qarşıla və onunla görüş."(۱)

۳. İmam Sadiqin (ə) dostlarından biri nəql edir ki, o həzrətə (ə) ərz etdim: "Yaxşı əxlaqın şərti nədir?"

həzrət (ə) buyurdu: "Bu sənin təvazökarlıq göstərməyin, şirindil olmağın və qardaşınla gülərüzlə rəftar etməyindir."(۲)

۴. Həsən ibn Hüseyn deyir ki, imam Sadiq (ə) buyurdu: "Peyğəmbər (s) Əbdül-Mütəllibin oğlanlarına xitab edib buyurdu: Ey Əbdül-Mütəllibin övladları! Siz heç vaxt öz malınızla camaatın həyatında rahatlıq yarada bilməzsiniz. Elə isə onlarla mehriban və gülərüzlə rəftar edin."(۳)

(Beşinci hədis dördüncü hədis kimidir).

۵. İmam Sadiq (ə) buyurdu: "hər kim üç şeydən birini Allaha xatir yerinə yetirərsə, Allah cənnəti ona vacib edər: ۱. Yoxsulluq halında infaq etmək; ۲. Bütün camaatla mehriban olmaq; ۳. Başqalarına qarşı insafa riayət etmək."(۴)

۶. Musa ibn Cəfər (ə) nəql edir ki, peyğəmbər

səh:۱۵۲

---

۱- [۱] . Həmin mənbə.

۲- [۲] . Üsuli Kafi, səh.۳۵۹; Əl-fiqhiyyə... məaniyul-əxbar, səh.۷۴.

۳- [۳] . Üsuli Kafi, səh.۳۵۹.

۴- [۴] . Həmin mənbə.

(s) buyurdu: "Gülərüz və mehriban olmaq kini aradan aparar."(١)

٧. İmam Cavad (ə) atalarından nəql edir ki, həzrət Əli (ə) buyurdu: "Siz camaata öz malınızla kömək edə bilmirsinizsə, onları mehriban və gülərüzlə qarşılamaqla razı salın. Çünki peyğəmbərdən (s) eşitdim ki, buyurardı: Siz heç vaxt camaatın həyatında malınızla rahatlıq yarada bilməsəniz, elə isə əxlaqınızla onları razı salın."(٢)

١٠٨. DOğRU DANıŞMAğıN VACIBLIYINə AID BöLMə

١. İmam Sadiq (ə) buyurdu: "Camaatı dilinizdən başqa şeylə (yəni əməliniz və rəftarınızla) yaxşılığa dəvət edin və onlar da sizin pərhizkarlığınızı, doğru danışmağınızı və ibadətdə çalışmağınızı görsünlər."(٣)

٢. İmam Sadiq (ə) buyurdu: "hər kimin dili düz olsa əməli də pakdır."(۴)

٣. Əbu Bəsir deyir ki, imam Sadiq (ə) buyurdu: "Allah bəndəsi doğru danışandan sonra Allah yanında doğrulardan və yalan danışanda isə Allah yanında yalançılardan hesab olunar. O doğru danışanda Allah Əzzəvəcəl buyurar: Bu bəndə doğru danışdı və yaxşı insandır, yalan danışanda isə Allah buyurar: Bu bəndə yalan dedi və pis insandır."(۵)



---

١- [١] . Həmin mənbə.

٢- [٢] . Üsuli Kafi.

٣- [٣] . Üsuli Kafi, səh.٣۶٠.

۴- [۴] . Üsuli Kafi, səh.٣۶٠.

۵- [۵] . Üsuli Kafi, səh.٣۶٠.

۴. İmam Sadiq (ə) buyurdu: "hər kimin dili düz olarsa əməli də pakdır. hər kimin niyyəti yaxşı olarsa, ruzisi də çoxalar və hər kim ailəsinə yaxşılıq etsə ömrü uzanar."(۱)

۵. Əmr ibn Əbi Miqdam deyir ki, ilk dəfə imam Baqirin (ə) xidmətinə çatanda o həzrət (ə) buyurdu: "Söz danışmazdan qabaq doğru danışmağı öyrənin."(۲)

۶. İmam Sadiq (ə) buyurdu: "Ey Fuzeyl! İlk dəfə doğru danışanı təsdiq edən Allah Əzzəvəcəldir və bilir ki, o doğru danışandır, həmçinin insanın özü də özünü təsdiq edir. Çünki doğru danışdığını bilir."(۳)

۷. Rəbi ibn Səd deyir ki, imam Baqir (ə) mənə buyurdu: "Ey Rəbi! İnsan o qədər doğru danışır ki, Allah onu "siddiq" (çox doğru danışan) kimi yazır."(۴)

۸. Peyğəmbər (s) buyurdu: "Sabah qiyamət günü sizin hamınızdan mənə daha yaxını və şəfaəti də mənə daha vacib olanı sözlərində düz danışan, əmanəti sahibinə qaytarmaqda düzgün olan, yaxşı əxlaqlı və camaata daha yaxın olan kəsdir."(۵)

۹. Ravisi bilinməyən bir hədisdə imam Sadiq (ə) rəvayət edir ki, peyğəmbər (s) buyurdu: "Ey Əli! Sənə bir neçə şeyi tövsiyə edirəm. Pərvərdigara! Bunların Əlidə (ə) olmasına kömək ol. Onların

səh:۱۵۴

---

۱- [۱]. Üsuli Kafi, səh.۳۶۰.

۲- [۲]. Babus-sidq (Üsuli Kafi, səh.۳۶۰).

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Həmin mənbə.

۵- [۵]. Məcalis, Şeyx Səduq, səh.۳۰۴.

(birincisi doğru danışmaqdır və heç vaxt ağzından yalan çıxmasın."(۱)

BIR IL OLSA DA BeLə VeRDIYI VəDəYə SADIQ QALMAğıN MüSTəhəBLIYINə AID .۱۰۹ BöLMə

۱. İmam Sadiq (ə) buyurdu: "İsmayıla (ə) sadiqul-vədə (vədəsinə əməl edən) deyərdilər. Çünki bir yerdə bir nəfərə vədə vermişdi və ona görə bir il gözləməli oldu. Nəticədə Allah onu sadiqul-vədə adlandırdı. Bir il keçəndən sonra o adam İsmayılın (ə) yanına gəldi və İsmayıl (ə) ona dedi: Mən həmişə sənin intizarınızdaydım."(۲)

۲. İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) buyurubdur: "Allaha və cəza gününə imanı olan gərək verdiyi vədəyə vəfa etsin."(۳)

۳. Hușam ibn Salim deyir ki, imam Sadiqdən (ə) eşitdim buyurdu: "Mömininin din qardaşına verdiyi vədəsi kəffarəsiz bir nəzirdir. Vədəsinə əməl etməyən kimsə Allahla olan vədəyə əməl etməməyə başlamış və özünü Allahın qəzəbi qarşısında qərar vermişdir. Burada mübarək ayənin də mənası belədir və Allah taala buyurur:

Ey dildə iman gətirənlər, etməyəcəyiniz bir şeyi niyə deyirsiniz? (Niyə əməl etməyəcəyinizi bilə-bilə vədə



---

۱- [۱]. Məhasin.

۲- [۲]. Babus-sidq (Üsuli Kafi, səh.۳۶۰).

۳- [۳]. Həmin mənbə.

(verirsiniz?) Etməyəcəyiniz bir şeyi deməyiniz Allahın yanında çox mənfurdur."(۱) (۲)

Süleyman Cəfəri deyir ki, imam Riza (ə) buyurdu: "həç bilirsən niyə həzrət İsmayıl (ə) .۴
"?"sadiqul-vədə" (vədəsinə əməl edən) adlanıb

.Ərz etdim: Yox

həzrət (ə) buyurdu: "İsmayıl (ə) bir nəfərə vədə verdi və onu bir il (vədəsinə əməl
(etmək üçün) oturub gözlədi."(۳)

Abdulla ibn Sənan deyir ki, imam Sadiq (ə) buyurdu: "Peyğəmbər (s) bir yerdə bir .۵
".nəfərə vədə verdi və buyurdu: "Mən burada səni qayıdana kimi gözləyirəm

İmam (ə) buyurur ki, günəşin həzrətin (s) üzərində olan istiliyi o qədər şiddətli idi ki,
".dostları ərz etdilər: "Ya Rəsuləllah! Yaxşı olar ki, kölgə olan yerə gedəsiniz

həzrət (s) buyurdu: "Mən burada o adama vədə vermişəm. Əgər gəlməsə qiyamət
(günü gərək cavab versin."(۴)

həYANıN MüSTəhəBLIYINə AID BöLMə .۱۱۰

İmam Sadiq (ə), ya da imam Baqir (ə) buyurdu: "həya və imanın hər ikisi bir yerə .۱
bağlanıblar. Əgər



---

.Səf surəsi, ayə ۲ və ۳ . [۱] -۱
.Üsuli Kafi, səh.۴۷۴ . [۲] -۲
.İləluş-şəraye, səh.۳۷; Uyunu əxbarir-Riza, səh.۲۳۳ . [۳] -۳
.İləluş-şəraye, səh.۳۷ . [۴] -۴

(onlardan biri gedərsə, o birisi də həmçinin onun ardınca gedər."(١)

٢. İmam Sadiq (ə) buyurdu: "həya imanın bir hissəsidir və iman da cənnətə getmək üçün bir vasitədir."(٢)

٣. İmam Sadiq (ə) buyurdu: "hər kimin həyası olmasa, imanı da yoxdur."(٣)

٤. İmam Sadiq (ə) buyurdu: "həya, iffət, az danışmaq nəinki iradəsizlikdir, bəlkə imanın əlamətlərindəndir."(٤)

٥. Peyğəmbər (s) buyurdu: "hər kimdə dörd xasiyyət olarsa, əgər başdan ayağa günaha batmış olsa da belə, Allah taala onun günahlarını savaba çevirər: ١. Doğru danışmaq; ٢. həyalı olmaq; ٣. Yaxşı əxlaq; ٤. Təşəkkür etmək."(٥)

٦. İmam Əli (ə) buyurdu: "hər kim həya paltarını geyərsə, camaat onun eybini görməz."(٦)

٧. Peyğəmbər (s) buyurdu: "hər hansı bir şeydə fəxr olsa sahibinin məqamını, hörmətini azaldar və hər hansı bir şeydə həya olsa o sahibinə zinət bəxş edər."(٧)



---

١- [١]. Babul-həya), Üsuli Kafi, səh.٣٦٠.
٢- [٢]. Üsuli Kafi, səh.٣٥٩.
٣- [٣]. Üsuli Kafi, səh.٣٦٠
٤- [٤]. Həmin mənbə.
٥- [٥]. Həmin mənbə.
٦- [٦]. Nəhcül-bəlağə, ٢-ci cild, səh.١٩٤.
٧- [٧]. Məcalis, Şeyx Tusinin oğlu, səh.١١٩.

Peyğəmbərin (s) qısa kəlamlarında buyurulur: "həyanın hamısı xeyir və . ٨
(yaxşılıqdır."(١

həzrət Əlinin (ə) oğlu Məhəmməd hənəfiyyə olan tövsiyələrindən birində belə . ٩
(gəlibdir: "hər kim həya paltarını geysə, onun eybi gözlərdən gizlin qalar."(٢

Peyğəmbər (s) buyurdu: "həya və iffətin hamısı xeyir və yaxşılıqdır. Yəni, həya . ١٠
dindarı və dinsizi pis işlərdən çəkindirər. həya və iffət bütün gözəllikləri özündə
(cəmləşdirir."(٣

Peyğəmbər (s) buyurdu: "həya və imanın hər ikisi bir yerə bağlıdırlar. Əgər . ١١
(onlardan biri aradan gedərsə, digəri də həmçinin aradan gedəcək."(۴

Peyğəmbər (s) buyurdu: "Əgər Allah həyanı öz bəndəsindən alsa, bu zaman bəndə .١٢
Allahın düşməni olar və nifrətinə tuş gələr. Əgər insandan həya götürülsə, Allahın
rəhməti ondan silinər və İslamın da bağlı olduğu ip də ondan açılar və belə bəndə
(Allahın rəhmətindən uzaq olan bir şeytana çevrilər."(۵

DIN höKMLəRI BARəSINDə SUAL SORUşMAQDAN UTANMAğıN CAIZ . ١١١
OLMAMASıNA AID BöLMə

İmam Sadiq (ə) buyurdu: "hər kim bir şey .١



---

.Mən la yəhzuruhul-fəqih", ٢-ci cild, səh.٣۴٣" . [١] -١

.Mən la yəhzuruhul-fəqih", ٢-ci cild, səh.٣۴٧" . [٢] -٢

.Məaniyul-əxbar, səh.١١۶ . [٣] -٣

.Həmin mənbə . [۴] -۴

Həmin mənbə. hər iki rəvayətə bir neçə cümlə əlavə olunubdur, lazım olanda . [۵] -۵
."Məaniyul-əxbar" kitabına müraciət olunsun

(barəsində soruşmaqdan xəcalət çəkərsə elmində süstlük yaranar."(۱)

Ravisi bilinməyən bir hədisdə peyğəmbər (s) buyurdu: "həya iki növdür: ۱. Ağıl həyası .۲ .(yəni düşüncə üzündən olan həya). ۲. Axmaqlıq həyası

(Ağıl həyası, elm və axmaqlıq üzündən olan həya isə nadanlıqdır."(۲)

ƏFV Və GüZəşTIN MüSTəhəBLIYINə AID BöLMə .۱۱۲

İbn Fəzzal deyir ki, imam Musa ibn Cəfər (ə) buyurdu: "heç vaxt iki dəstə bir-birləri .۱ ilə qarşı-qarşıya gəlməmişdən qabaq (bir-birləri ilə müharibə etməmişdən qabaq) hər (hansının güzəşti çox olsaydı, o qalib gələrdi."(۳)

Peyğəmbər (s) buyurdu: "Sizə güzəşt və əfv etməyi nəsihət edirəm. Çünki, güzəşt .۲ (bəndənin izzətini artırar. Elə isə bir-birinizi əfv edin ki, Allah sizi də əziz etsin."(۴)

İmam Baqir (ə) buyurdu: "Peyğəmbəri (s) zəhərləmək üçün qoyun ətini yedizdirmək .۳ istəyən yəhudi qadınını o həzrətin (s) yanına gətirdilər. həzrət (s) buyurdu: "Sənin bu "?işdən məqsədin nədir

Qadın cavab verdi: "Mən öz-özümə dedim ki, əgər bu şəxs peyğəmbər (s) olsa zəhər ona təsir



---

.(Üsuli Kafi, səh.۳۶۲, (Babul-əfv . [۱] -۱

.Həmin mənbə . [۲] -۲

.Həmin mənbə . [۳] -۳

.Üsuli Kafi, səh.۳۶۱ . [۴] -۴

".göstərməyəcək və əgər padşah olarsa, camaatı onun əlindən rahat edərəm

(Ravi deyir ki, peyğəmbər (s) onu bağışladı."(١

İmam Baqir (ə) buyurdu: "Əfvdən sonrakı peşmançılıq cəzadan sonrakı . ۴
(peşmançılıqdan daha üstün və daha da asandır."(٢

Rəsulullahdan (s) buyurulan qısa kəlamlarda gəlibdir: "Padşahın güzəşti onun . ۵
(hökumətini daha çox davamlı edər."(٣

İmam Riza (ə) Quranda buyurulan "Gözəl tərzdə onları haqqa dəvət et"(۴) ayəsinin .۶
(izahında buyurdu: "Bu danlamadan və məzəmmət etmədən məqsəd əvf etməkdir."(۵

(ci hədis ۶. cı hədis kimidir. (۶ .٧

İmam Əli (ə) buyurdu: "Öz düşməninə qalib gələndə ona güzəştə getməyi qələbənin .٨
(şükrü kimi qərar ver."(٧

İmam Əli (ə) buyurdu: "İnsanların güzəştə ləyaqəti olanı, cəza verməyə qüdrəti . ٩
(çatan kəsdir."(٨

İmam Baqir (ə) bir hədisdə atalarından nəql edir ki, peyğəmbər (s) buyurdu: . ١٠
"Qiyamət günü



---

.(Üsuli Kafi, səh.٣۶٢, (Babul-əfv . [١] -١
.Üsuli Kafi, səh.٣۶١ . [٢] -٢
.Mən la yəhzuruhul-fəqih", ٢-ci cild, səh.٣۴٣" . [٣] -٣
.hicr surəsi, ayə ٨۵ . [۴] -۴
.Məaniyul-əxbar, səh.١٠۶ . [۵] -۵
.Məcalis, Şeyx Səduq . [۶] -۶
.Nəhcül-bəlağə, ٢-ci cild, səh.١۴۵ . [٧] -٧
.Nəhcül-bəlağə, ٢-ci cild, səh.١۵۵ . [٨] -٨

olanda Allah tərəfindən nida edən elə elan edər ki, bütün camaat eşidər. O deyər: "?"Fəzilət sahibləri haradadırlar

Camaatdan bir dəstəsi ayağa qalxarlar və bu zaman mələklər onları qarşılayar və "?soruşarlar: "Sizin fəzilətiniz nədir ki, onlara görə sizi istədilər

Onlar deyərlər: "Dünyada bizi nadan çağırdılar biz dözdük, bizə pislik etdilər biz isə əfv ".etdik

Bu zaman Allah tərəfindən müraciət olunar: Mənim bəndələrim düz deyirlər, onların (yolunu açın və sorğu-sualsız cənnətə daxil olsunlar."(١

ZüLMKARı əFV eTMəYIN, SILeYI-RəhMIN, YAXşıLığıN, BIR şeY BAğışLAMAQLA .١١٣ höRMəT eTMəYIN Və SAIRIN MüSTəhəBLIYINə AID BöLMə

İmam Sadiq (ə) nəql edir ki, peyğəmbər (s) bir xütbədə buyurdu: "Sizə dünya və .١ axirətin ən yaxşı əxlaqından xəbər verməyim? Sənə zülm edəni əfv et, səndən əlaqəsini kəsənlə rabitə yarat, sənə pislik edənə yaxşılıq et, səni məhrum edənə (bəxşiş və əta et."(٢

Əbu Həmzə Sumali deyir ki, imam Əli ibn Hüseyn (ə) buyurdu: "Qiyamət günü .٢ gələndə Allah birinci və axırıncıları bir yerə toplayar və Allah tərəfindən nida edən .fəryad çəkər ki, fəzilət sahibləri haradadırlar? Camaatın bir dəstəsi ayağa qalxarlar



---

.Məcalis, Şeyx Müfidin oğlu, səh.۶٣ .[١]-١

.(Üsuli Kafi, səh.٣۶١, (Babul-əfv .[٢]-٢

?Mələklər onlarla görüşəndə soruşarlar: Sizin fəzilətiniz nə idi

Onlar cavab verərlər: Bizimlə əlaqəsini kəsən adamlarla biz əlaqə qurardıq, bizi məhrum edənə (bir şey) bağışlardıq, bizə zülm edənə biz güzəşt edərdik.

(Onlara deyilər: Siz doğru danışdınız, cənnətə daxil olun."(۱

۳. İmam Sadiq (ə) buyurdu: "Üç şey dünya və axirətin yaxşı xüsusiyyətlərindəndir. Sənə zülm edəni əfv edəsən, səndən əlaqəni kəsənlə əlaqə qurasan və sənə qarşı (nadanlıq edəndə özünü saxlaya biləsən."(۲

۴. İmam Baqir (ə) buyurdu: "Allah üç şeyin vasitəsilə müsəlmanın izzətini artırar: Zülm edəni bağışlamaqla, məhrum edənə bəxşiş verməklə, əlaqəni kəsənlə rabitə (yaratmaqla."(۳

۵. Peyğəmbər (s) buyurdu: "Sizə dünya və axirətin ən yaxşı əxlaqını göstərməyim? Səninlə əlaqəsini kəsənlə rabitə yaratmaq, səni məhrum edən kəsə (ehtiram əlaməti (olaraq bir şey) bağışlamaq və sənə zülm edənə güzəştə getmək."(۴

۶. İmam Əli ibn Musa ər-Riza (ə) nəql edir ki, peyğəmbər (s) buyurdu: "Sizə yaxşı əməlləri nəsihət edirəm. Çünki Allah məni onun üçün göndəribdir.



---

۱-[۱] . Üsuli Kafi, səh.۳۶۱; Məcalis, Şeyx Müfidin oğlu, səh.۶۲

۲-[۲] . Üsuli Kafi, səh.۳۶۱.

۳-[۳] . Üsuli Kafi, səh.۳۶۲.

۴-[۴] . Üsuli Kafi, səh.۳۶۱.

Yaxşı əməllərdən bir neçəsi budur ki, insan ona zülm edəni əfv etsin, onu məhrum edənə bir şey bağışlasın, onunla əlaqəni kəsənlə əlaqə yaratsın və onun görüşünə gəlməyənin görüşünə getsin."(۱)

۷. İmam Əli (ə) oğlu Məhəmməd hənəfiyyə etdiyi vəsiyyətində buyurdu: "Qardaşın səninlə əlaqəni kəsərsə, sən onunla əlaqə yarat və onun pisliyi gərək sənin yaxşılığından çox olmasın."(۲)

۸. Zürarə deyir ki, imam Sadiq (ə) buyurdu: "Biz elə bir sülaləyik ki, bizim mərdliyimiz bizə zülm edənə güzəşt etməkdir."(۳)

۹. Əli ibn Cəfər ibn Məhəmməd deyir ki, Məhəmməd ibn İsmayıl İraqa səfərə çıxmaq istəyəndə əmisi imam Musa Kazımdan (ə) icazə istədi və həzrət (ə) ona icazə verdi. Məhəmməd ayağa qalxdı və dedi: "Əmican! İstəyirəm mənə nəsihət verəsən."

həzrət (ə) buyurdu: "Sənə mənim qanımı axıtmaqda Allahdan qorxmağı tövsiyə edirəm."

Məhəmməd dedi: "Allah sənin qanını axıtmaq üçün çalışan adama lənət etsin."

Daha sonra dedi: "Əmican, mənə nəsihət ver."

həzrət (ə) yenə buyurdu: "Sənə mənim qanımı axıtmaqda Allahdan qorxmağı nəsihət edirəm."

Ravi deyir ki, həzrət (ə) içərisində ۱۵۰ dinar



---

۱- [۱] . Məcalis, Şeyx Müfidin oğlu, səh.۳۰۴.

۲- [۲] . "Mən la yəhzuruhul-fəqih, ۲-ci cild, səh.۳۴۸.

۳- [۳] . Xisal, Səduq, ۱-ci cild, səh.۹.

olan pul kisəsini ona verdi və Məhəmməd də onu aldı. Sonra isə həzrət (ə) yenə də ۱۵۰ dinar olan başqa bir pul kisəsini ona bağışladı və Məhəmməd onu da həmçinin aldı. Həzrət (ə) yenə üçüncü dəfə də ۱۵۰ dinar olan pul kisəsini ona verdi. Daha sonra isə həzrət (ə) Məhəmməddə olan ۱۵۰۰ dirhəmi ona bağışladı. Ravi deyir ki, ərz etdim: "Ona ".çox pul verdiniz

Həzrət (ə) buyurdu: "Bunlar mənim onun üçün çox aydın olan dəlilimdir. O məndən ".əlaqəsini kəsərsə mən ona qarşı sileyi-rəhm (qohumluq əlaqələrini qururam) edirəm

Ravi sonra deyir ki, Məhəmməd Harun ər-Rəşidin yanına gedib əmisi imam Musa ibn Cəfərdən (ə) söz apardı ki, o xəlifəlik iddiası edir və ona pul çatır. Harun ona yüz min dirhəm verilməsini əmr etdi və o həmin gecə də dünyasını dəyişdi. Kuleyni eyni həmin rəvayətdə "o kisədə yüz dinar var idi" nəql etmişdir və rəvayətin axırında isə "o kisədə (üç min dirhəm var idi" fərqini qeyd etmişdir.(۱

QəZəBI UDMAğıN MüSTəhəBLIYINə AID BöLMə .۱۱۴

İmam Sadiq (ə) buyurdu: "Qəzəb səbr edən kəs üçün necə də yaxşı bir badədir. .۱ Çünki böyük bəlanın müqabilində böyük mükafat da vardır və Allah sevdiyi hər bir (dəstəni giriftar edər."(۲



---

.Rical, Kəşşi, səh.۱۷۱; Üsuli Kafi, səh.۲۶۷ . [۱] -۱
.(Üsuli Kafi, səh.۳۶۲ və ۳۶۳ (Babu kəzmil-ğəyzi . [۲] -۲

۲. İmam Səccad (ə) buyurdu: "Mehribanlığın və təvazökarlığın yerinə qırmızı dəvələrimin olmasını istəmərəm və mənim üçün heç bir badə insanı cəzalandırmadığım qəzəb badəsindən daha şirinini içməmişəm. (Yəni məndə olan belə bir xasiyyəti dünya malı ilə dəyişmərəm, heç vaxt razı olmaram ki, tünd xasiyyətli olum və eyni zamanda ən yaxşı heyvanlarım və dünyanın zər-zivəri məndə olsun.)"(۱)

۳. İmam Baqir (ə) nəql edir ki, atam mənə buyurdu: "Səbr və dözümlülük nəticəsində qəzəbi cilovlamaqdan daha yaxşı heç bir şey atanın gözünü nurani etməz və zillətli olan qırmızı tüklü dəvə də məni sevindirməz."(۲)

۴. Peyğəmbər (s) buyurdu: "Bəndəni Allah-taalaya tərəf aparan yol, iki badəni içməsidir: ۱. Özünü saxlamaq üçün qəzəb badəsi. ۲. Səbr və dözümünü göstərməklə müsibət badəsi."(۳)

۵. İmam Sadiq (ə) buyurdu: "Hər hansı bir bəndə qəzəbini cilovlayarsa, Allah dünya və axirətdə onun izzətini artırar. Çünki, Allah Əzzəvəcəl Quranda buyurub: (۴)Təqvalılar qəzəblərini udan və camaatın xətalarından keçənlərdirlər. Allah yaxşılıq edənləri sevir. Allah qəzəbi udmağın əvəzində onlara bu mükafatı (yaxşılıq edənləri sevməyi) əta edir."(۵)



---

۱- [۱]. Həmin mənbə.

۲- [۲]. Üsuli Kafi, səh.۳۶۳.

۳- [۳]. Həmin mənbə.

۴- [۴]. Ali İmran surəsi, ayə ۱۳۴.

۵- [۵]. Üsuli Kafi, səh.۳۶۲.

İmam Sadiq (ə) buyurdu: "Allah bəndəsinin içdiyi heç bir badə, səbr və dözümlülüklə .۶ qabağını aldığı və qəlbindən fırlanan qəzəb badəsindən Allah yanında daha sevimlisi olmaz." (Burada badədən məqsəd qəzəbli şəxsin həyəcan və coşqunluq nəticəsində (cəzalandırması və bağışlamaq arasındakı bir haldır.)(۱

Bərqi "Məhasin" kitabında yuxarıdakı rəvayət kimi başqa bir rəvayəti Vəşşadan nəql .۷ etmişdir. Lakin onun əvvəlində belə gəlmişdir: "Bir bəndənin gecənin qaranlığında, yalnız Allahın qorxusundan tökdüyü göz yaşından savayı heç bir göz yaşı Allah yanında (daha sevimli deyil."(۲

İmam Sadiq (ə) buyurdu: "hər kim qəzəbinə əməl etməyə qüdrəti olan halda onu .۸ (udarsa, Allah qiyamət günü onun qəlbini öz razılığı ilə doldurar."(۳

İmam Baqir (ə) buyurdu: "hər kim qəzəbini aşkar etməyə imkanı olan halda onu .۹ (udarsa, Allah qiyamət günü onun qəlbini iman və rahatlıqla doldurar."(۴

Rəsulullah (s) buyurdu: "hər kim qəzəbini udsa, Allah onun mükafatını verər və hər .۱۰ (kim bir müsibətə səbr etsə, Allah əvəzini verər."(۵

Peyğəmbər (s) həzrət Əliyə (ə) olan vəsiyyətində buyurdu: "Ya Əli, sənə nəsihət .۱۱ edirəm, bunu yadında



---

.Üsuli Kafi, səh.۳۶۳; Məhasin Bərqi, səh.۲۹۲ . [۱] -۱

.Həmin mənbə . [۲] -۲

.Üsuli Kafi, səh.۳۶۲ . [۳] -۳

.Üsuli Kafi, səh.۳۶۳ . [۴] -۴

.Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۳۴۲" . [۵] -۵

saxla və əgər mənim vəsiyyətimə əməl etsən xeyir taparsan. Ya Əli! hər kim aşkar etməyə qüdrəti çatdığı qəzəbini udsa, Allah ona iman və təskinlikdən olan bir mükafat verər və onun dadını bilər."(۱)

۱۲. İmam Sadiq (ə) öz babalarından nəql edir ki, Rəsulullah (s) "mənahi" (nəhyə aid) hədislərində buyurdu: "hər kəs aşkar etməyə qüdrəti çatdığı qəzəbini udsa və özünü saxlasa, Allah ona şəhidin savabını verər."(۲)

۱۳. Rəbi ibn Əbdürrəhman deyir: "And olsun Allaha! Musa ibn Cəfər (ə) fərasətli və huşlu idi. Onun əleyhinə çıxan və ondan sonrakı imamın rəhbərliyini inkar edənləri tanıyardı. Bununla belə onlara qarşı olan qəzəbini udardı və onların barəsində bildiklərini onların üzünə vurmazdı. Buna əsasən o "Kazim" adlandı."(۳)

۱۴. Peyğəmbər (s) xütbələrinin birinin axırında buyurdu: "hər kim qəzəbini udub müsəlman qardaşına güzəşt etsə, Allah ona şəhidin mükafatını verər."(۴)

۱۵. İmam Sadiq (ə) buyurdu: "hər kimdə üç xasiyyət olarsa, Allah onu ürəyi istədiyi kimi hurul-eynlə evləndirər. Onlar bunlardan ibarətdir: ۱. Qəzəbini udmaq. ۲. Allah yolunda qılınclara səbr etmək. ۳. haram mala əl tapıb, lakin Allaha xatir ondan keçən."(۵)



---

۱- [۱]. "Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۳۳۳.

۲- [۲]. "Mən la yəhzuruhul-fəqih", ۲-ci cild, səh.۱۹۸.

۳- [۳]. İləluş-şəraye, səh.۸۹.

۴- [۴]. İqabul-əmal, səh.۴۷.

۵- [۵]. Məhasin Bərqi, səh.۶.

DIN DüşMəNLəRININ höKUMəTI ZAMANıNDA ONLARA QARşı OLAN QəZəBI .١١٥ UDMAğıN MüSTəhəBLIYINə AID BöLMə

İmam Sadiq (ə) buyurdu: "Düşmənin hökuməti və iqtidarı zamanında qəzəbi udmaq .١ uzaq görən kəs üçün təqiyyə və ehtiyatdır. Təqiyyəni riayət etmədən düşmənləri iqtidarı zamanında onları söymək və onlarla düşmənçilik etmək Allah Əzzəvəcəlin əmrini tərk etməkdir. Elə isə camaatla mülayim olun ki, sizin əməlləriniz onların yanında böyük cilvələnsin (sizi yaxşı yad etsinlər). Ədavət saxlamaq və düşmənçilik (etməklə onları boynunuza mindirib xar və rüsvay olmayın."(١)

PAXıL INSANLAR Və ONLAR KIMI ADAMLARıN MüQABILINDə SəBR eTMəYIN .١١۶ MüSTəhəBLIYINə AID BöLMə

İmam Sadiq (ə) buyurdu: "Nemət düşmənlərinin (paxıl insanların) müqabilində səbr .١ et. Çünki Allaha itaətsizlik etməklə sənə qarşı olan kəsdən, heç vaxt sənin Allaha itaət (etməyindən daha yaxşı bir əməllə ondan əvəz çıxmaq olmaz."(٢)

Peyğəmbər (s) buyurdu: "Allah dörd bəla barəsində mömindən əhd alıbdır. Onların .٢ mömin üçün daha çətin olanı bir möminin zahirdə onunla eyni əqidədə olub lakin ona həsəd aparmasıdır. Yaxud bir münafiqin onun zəif nöqtələrini tapmağın



---

.Üsuli Kafi, səh.٣۶٢; Məhasin Bərqi, səh.٢۵٩ . [١] -١
Mən la yəhzuruhul-fəqih", ٢-ci cild, səh.٣۵٠; Xisal, Səduq, ١-ci cild, səh.١٣; Üsuli' . [٢] -٢
.(Kafi, səh.٣۶٣ (Babu kəzmil-ğəyzi

dalınca olsun, ya da şeytan onu azdırsın, ya da bir kafir onunla döyüşməyə ayağa qalxsın. Mömin üçün bunlarda həyat yoxdur. Yəni bu giriftarçılıqla mömin nə qədər (dözə bilər."(۱)

۳. Davud ibn Sərhan deyir ki, imam Sadiq (ə) buyurdu: "Mömin dörd şeydən, ya da onlardan birindən kənarda deyil. O, bir möminin başqa bir möminə həsəd aparmasıdır və bu bütün giriftarçılıqlardan daha da